**1924-cü ildən çıxır**

# AZƏRBAYCAN MƏKTƏBİ

**TƏSİSÇİ**
**Azərbaycan Respublikası**
**Təhsil Nazirliyi**

**May-İyun**
**№ 3 (655)**
**2013**

**Elmi-nəzəri, pedaqoji jurnal**

## BU NÖMRƏDƏ

---

LİSENZİYA № 022589

**Jurnal Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir.**

**Jurnal akademik Mehdi Mehdizadə mükafatı laureatı adına layiq görülmüşdür.**

**Redaksiyanın əlaqə telefonları: 496-74-20; 496-74-19**

**Redaksiyanın ünvanı:** Bakı ş., Afiyəddin Cəlilov küçəsi, 22 (Təhsil Problemləri İnstitutunun binası, 409, 410 və 411-ci otaqlar). İndeks AZ 1025 Kağız formatı 70x108 1/16 Sifariş:

---

Jurnal redaksiyanın kompyuter mərkəzində yığılıb səhifələnmiş, "Ərgünəş" Fərdi Müəssisəsinin (Nəşriyyat-Poliqrafiya) mətbəəsində çap olunmuşdur.

## В этом номере

**In this number**

## M.Ç.Cabbarovun Azərbaycan Respublikasının

## təhsil naziri təyin edilməsi haqqında

## Azərbaycan Respublikası Prezidentinin

## Sərəncamı

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 5-ci bəndini rəhbər tutaraq **qərara alıram:**

Mikayıl Çingiz oğlu Cabbarov Azərbaycan Respublikasının təhsil naziri təyin edilsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**
*Bakı şəhəri, 19 aprel 2013-cü il*

## M.C.Mərdanovun Azərbaycan Respublikasının

## təhsil naziri vəzifəsindən azad

## edilməsi haqqında

## Azərbaycan Respublikası Prezidentinin

## Sərəncamı

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 5-ci bəndini rəhbər tutaraq **qərara alıram:**

Misir Cumayıl oğlu Mərdanov Azərbaycan Respublikasının təhsil naziri vəzifəsindən azad edilsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**
*Bakı şəhəri, 19 aprel 2013-cü il*



## Mikayıl Çingiz oğlu Cabbarov

1976-cı il sentyabrın 19-da Bakı şəhərində anadan olmuşdur.

1992-ci ildə Bakı Dövlət Universitetinin beynəlxalq hüquq fakültəsinə daxil olmuş, 1997-ci ildə fakültəni fərqlənmə diplomu ilə bitirmişdir.

1997-1998-ci illərdə ABŞ-ın Kaliforniya ştatının Sakramento şəhərindəki Pasifik Universitetinin Macgeorge hüquq məktəbində hüquq, 2004-cü ildə isə Azərbaycan Dövlət İqtisad Universitetində iqtisadiyyat üzrə magistr dərəcələri almışdır.

1999-cu ildən ABŞ-ın Nyu-York ştatında Vəkillər Kollegiyasının (New York Bar) üzvüdür.

Əmək fəaliyyətinə 1995-ci ildən bank sektorunda başlamış, 1999-2002-ci illərdə hüquq şirkəti və özəl sektorda hüquqşünas kimi fəaliyyət göstərmişdir.

2002-2003-cü illərdə iqtisadi inkişaf nazirinin müşaviri, 2003-2004-cü illərdə Azərbaycanda İxracın və İnvestisiyaların Təşviqi Fondunun (AZPROMO) prezidenti vəzifələrində çalışmışdır.

Azərbaycan Respublikası Prezidentinin 2004-cü il 20 fevral tarixli Sərəncamı ilə iqtisadi inkişaf nazirinin müavini vəzifəsinə təyin edilmişdir. Həmin vəzifədə işlədiyi dövrdə beynəlxalq maliyyə qurumları ilə əməkdaşlıq, xarici iqtisadi əlaqələr, xarici investisiya siyasəti, beynəlxalq arbitrajlarda hüquqi məsələləri və korporativ idarəetmə kimi fəaliyyətlərin əlaqələndirilməsini həyata keçirmişdir.

Azərbaycan Respublikası Prezidentinin 2009-cu il 6 mart tarixli Sərəncamı ilə Nazirlər Kabineti yanında “İçərişəhər” Dövlət Tarix-Memarlıq Qoruğu İdarəsinin rəisi vəzifəsinə təyin edilmişdir.

Müxtəlif illərdə Qərb Universiteti və Dövlət İqtisad Universitetində “Biznes hüququ” və “Hüququn əsasları” fənlərindən dərs demişdir.

İctimai həyatda fəal rol oynayır. 1996-1997-ci illərdə Azərbaycan Gənclər Təşkilatları Forumunun sədr müavini seçilmişdir. “Nə? Harada? Nə vaxt?” və “Brey Rinq” oyunlarının fəal üzvü olmuşdur.

1994-1997-ci illərdə “Atəşgah” Bakı Bilicilər Klubunun prezidenti olmuşdur.

Müxtəlif illərdə MDB və dünya çempionu adını qazanmışdır. 1997-ci ildə Rusiyanın 1-ci kanalında yayımlanan “Nə? Harada? Nə vaxt?” oyununda Azərbaycandan olan ilk bilici olmuşdur.

Evlidir, 2 övladı var.

Azərbaycan Respublikası Prezidentinin 2013-cü il 19 aprel tarixli Sərəncamı ilə Azərbaycan Respublikasının təhsil naziri təyin edilmişdir.

# AZƏRBAYCANÇILIQ VƏ AZƏRBAYCANŞÜNASLIQ...

**Nizami Cəfərov**
***filologiya elmləri doktoru, professor,***
***AMEA-nın müxbir üzvü***

Hər hansı ideya və ya ideoloji sistem o zaman şüurlarda özünə möhkəm yer tutur, uzun zaman insanlığa xidmət edə bilir ki, cəmiyyət onu elm kimi qavrasın–bunun üçünsə, intellektual - ideoloji həyatın təcrübəsi göstərir ki, üç şərt vacibdir:

1) ideya və ya ideoloji sistem, bu və ya digər miqyasda, praktikadan irəli gəlməli, ona dayanmalıdır;

2) elmi təfəkkürün ümumbəşəri texnologiyaları əsasında qurulmalı, sözün geniş mənasında ənənəvi elmi dillə danışmalıdır;

3) humanist olmalı, cəmiyyətə, insanlığa xidmət etməlidir.

Azərbaycan xalqının ümummilli lideri, türk dünyasının və ümumən dünyanın böyük siyasi mütəfəkkirlərindən biri olan Heydər Əliyevin yarım əsrdən artıq bir dövrdə irəli sürdüyü, uğrunda mübarizə apardığı (və həyata keçirdiyi) ideyaların (Əliyevçiliyin) bütöv, mükəmməl və sistemli bir elm (əliyevşünaslıq) səviyyəsinə qaldırılması üçün hər cür şərtlər (şərait) mövcuddur. Əliyevçilik: birincisi, ictimai təcrübədən irəli gəlməsi, milli olduğu qədər də ümumbəşəri elmi təfəkkür modelləri və ya sxemləri ilə ifadə oluna bilməsi və humanizmi, insanlığa xidmət etməsi, yəni elmə çevrilə bilmək imkanlarının genişliyi ilə diqqəti çəkir; ikincisi, ümummilli liderin müəllifi olduğu ideyalar illər keçdikcə daha da zənginləşir, ehtiva coğrafiyasını daha da genişləndirir və dünyanın siyasi - ictimai təfəkkür tarixində öz danılmaz yerini müəyyənləşdirir; nəhayət, əliyevçiliyin elmi - metodoloji tədqiqi get-gedə daha ardıcıl xarakter daşımağa başlayır.

Etiraf etmək lazımdır ki, əliyevçilik yalnız müasir azərbaycançılıq olaraq qalmadı, eyni zamanda, azərbaycançılığın bir ideologiya olaraq düzgün təfsirində həlledici rol oynadı.

Azərbaycan haqqında müxtəlifmənşəli, müxtəlifxarakterli mənbələrin verdiyi bu və ya digər elmi məlumatlar qədim dövrlərdən başlasa da, azərbaycanşünaslıq kifayət qədər mükəmməl bir elm olaraq XX əsrin 30-cu illərində formalaşmışdır. Azərbaycanşünaslığın meydana çıxması Azərbaycanda elmi təfəkkürün inkişafı ilə yanaşı (bəlkə də, daha çox) azərbaycançılıq dünyagörüşünün təşəkkülü ilə bağlı olmuşdur ki, bu da özünü milli-ictimai təfəkkürün müxtəlif sahələrində göstərmişdir. XIX əsrin sonu, XX əsrin əvvəllərindən etibarən azərbaycanlı mütəfəkkirlər türklük, müsəlmanlıq və müasirlikdən ibarət bir məmləkət barəsində düşünməyə (hətta döyüşməyə!) başlamış, təsəvvürlərində yaratdıqları həmin məmləkəti –Azərbaycanı ilk dəfə 1918-1920-ci illərdə bütün reallığı ilə gördükdən sonra onların düşüncələri (və döyüşləri, mücadilələri) daha konkret, daha məqsədyönlü, daha elmi xarakter almışdır. Bununla belə, qeyd etmək lazımdır ki, haqqında söhbət gedən dövrdə azərbaycançılıq dünyagörüşü Azərbaycanda geniş yayılmış müxtəlif ideologiyaların ardıcıl təzyiqinə məruz qaldığı, olduqca gərgin ideya münaqişələri gedişində formalaşdığı üçün daxili ziddiyyətlərdən, yaxud metodoloji eklektikadan xilas ola bilməmişdir. XX əsrin 20-ci, 30-cu illərində, yəni azərbaycan-

şünaslığın bir elm olaraq konturlarının sürətlə müəyyənləşdiyi dövrdə ideoloji münaqişələr bu və ya digər dərəcədə aradan qalxsa da, vulqar sosiologizm, sovet "beynəlmiləlçiliyi" həmin elmin bir sıra əsas problemlərinin (xüsusilə etnogenez probleminin) düzgün həllinə imkan vermədiyi kimi, azərbaycançılıq dünyagörüşünün təşəkkülü prosesinə də mane olmağa başladı. Beləliklə, bir tərəfdən, milli-ictimai (intellektual!) təfəkkür azərbaycanşünaslığın elmi əsaslar üzərində yüksəlməsini tələb edir, digər tərəfdən, siyasi-ideoloji şərait obyektiv araşdırmalara mane olur, elmi həqiqətləri müxtəlif "konsepsiyalar" arxasında gizlətməyə çalışırdı. XX əsrin 20-ci, xüsusilə 30-cu illərində azərbaycançılıq dünyagörüşünə özünəməxsus bir emosionallıq, romantik vüsət gəldi ki, bu, bizim fikrimizcə, həmin dünyagörüşün sosial-siyasi perspektivliliyini göstərirdi–azərbaycançılıq ideologiyasının banilərindən olan böyük Səməd Vurğunun yaradıcılığı, xüsusilə, məşhur "Azərbaycan" şeri bunu təsdiq edir:

El bilir ki, sən mənimsən,
Yurdum, yuvam, məskənimsən...

Həm azərbaycançılıq dünyagörüşünün, həm də azərbaycanşünaslıq elminin XX əsrin 30-cu illərində müəyyənləşmiş əsas prinsipləri sonrakı onilliklərdə, demək olar ki, dəyişmədi, yalnız 70-ci illərdən müəyyən "etirazlar" doğurmağa başladı ki, bu "etirazlar" da müxtəlif formalarda təzahür edirdi. Ümumiyyətlə, keçən əsrin (və minilliyin) sonlarına qədər həm azərbaycançılıqda, həm də xüsusilə azərbaycanşünaslıqda mübahisəli məsələlər mübahisəsiz məsələlərdən müqayisə edilməyəcək qədər çox olmuşdur. Odur ki, bu barədə bəhs edərkən əksəriyyətin ilk cəhddən qəbul edəcəyi fikirlər söyləmək nəinki çətin, hətta qeyri-mümkündür –olduqca müxtəlif mülahizələrlə, eyni fakt üzərində qurulmuş bir-birinə əks nəzəriyyələrlə qarşılaşmaq, həqiqəti məhz mübahisələrdən çıxarmaq lazım gəlir ki, bu da azərbaycanşünaslığın polemik xarakterli, əsasən problemlərdən ibarət bir elm olmasını şərtləndirir.

... Azərbaycanşünaslığın formalaşmasında türkoloqlar, iranşünaslar, qafqazşünaslar, semitoloqlar, demək olar ki, eyni dərəcədə iştirak etmişlər, ona görə də həmin elm sahələri üzrə mütəxəssislərin çox zaman biri digərini tamamilə inkar edən mülahizələrlə azərbaycanşünaslıqda sinkretik (və "beynəlmiləl!") bir "sistem" təşkil edir.

Əlbəttə, beynəlmiləl, ümumbəşəri dəyərlərə hörmət hər bir xalqın mükəmməlliyini, mədəni səviyyəsinin yüksəldiyini göstərir; bununla belə, hər hansı xalqı zorla beynəlmilləşdirmək ona heç bir "hüquq", yaxud nüfuz gətirməz, əksinə, həmin xalqı öz kökündən, tipologiyasından ayırıb dünya proseslərinin önündə gedənlərin kölgəsinə çevirər. Və XX əsrdə Azərbaycanda geniş yayılmış bir sıra kvazibeynəlmiləlçi konsepsiyalara əsaslansaq, onda gərək özümüzü konqlamerat bir etnik hadisə hesab edək–tarix isə heç zaman belə bir şey yaratmamışdır.

Azərbaycanşünaslığın ən mühüm problemi, heç şübhəsiz, Azərbaycan xalqının mənşəyi (etnogenezi) problemidir ki, 30-cu illərdən başalayaraq o, müxtəlif şəkillərdə "həll edilmişdir"– türkoloqlar türk, iranşünaslar İran, qafqazşünaslar bu və ya digər qeyd-şərtlə də olsa, Qafqaz (Alban) başlanğıcını əsas götürmüş, nəticə etibarilə mürəkkəb bir "metodoloji mənzərə" yaratmışdır. Odur ki, bu gün Azərbaycan dilinin, ədəbiyyatının, mədəniyyətinin təşəkkül tarixi barədə əsaslı (əksəriyyətin qəbul edəcəyi) bir fikir söyləmək olduqca çətindir; artıq mövqeyini möhkəmlətmiş "konsepsiyalar" mövcuddur ki, hər biri yeganə düzgün fikir sayılmaq iddiasındadır. Azərbaycan akademik tarixşünaslığı bu cür konsepsiya bolluğuna geniş şərait yaratmışdır:

"Azərbaycan xalqının təşəkkülündə Manna, Atropatena və Qafqaz Albaniyasında məskunlaşmış müxtəlif, o cümlədən Qafqaz və İran dillərində danışan qədim dövr və orta əsrlərin tayfa və xalqları–mannalılar, kaspilər, Atropatena madalıları, albanlar, azərilər və bir sıra digərləri əsas rol oynamışlar.

Əsrlər boyu Azərbaycana gəlmiş müxtəlifdilli tayfa və xalqlar (skiflər, saklar, alanlar, hunlar, sabirlər, xəzərlər, oğuzlar və b.) da Azərbaycan xalqının etnogenezisində böyük rol oynamışlar. Azərbaycan xalqının, dilinin formalaşması etnogenezin son mərhələlərində–orta əsrlərdə davam etmişdir" (Azərbaycan tarixi, Bakı, I c., 1998, s. 33-34).

Göründüyü kimi, bu "konsepsiya" Azərbaycan xalqının mənşəyi barədə hər cür volyuntarist nəzəriyyənin ortaya çıxması üçün münbit metodoloji şərait yaradır. Və bu "konsepsiya" yalnız səhv deyil, həm də mürtəcedir, xalqa öz keçmişini, etnik mənşəyini unutdurmaq "ehtiyac"ından irəli gəlmişdir. Ümumiyyətlə, azərbaycanşünaslığın sürətlə formalaşdığı 30-cu illər Azərbaycanda, bütövlükdə sovetlər birliyində türkçülüyə qarşı amansız mübarizə dövrüdür ki, həmin tendensiya özünü yuxarıda haqqında bəhs etdiyimiz "konsepsiya"da da göstərir. Burada hunlardan, sabirlərdən, xəzərlərdən, oğuzlardan və b. – dan bəhs olunur, lakin bunların eyni bir etnosa – türklərə aid olduğu deyilmir. Məqsəd ondan ibarətdir ki, Azərbaycan xalqının etnik tərkibində türklüyün yeri minimuma, köçəri gəlmələrin qeyri-türk mənşəli aborigenlərə sistemsiz təsiri səviyyəsinə endirilsin. Əlbəttə, bu cür tendensiyalı, xüsusi (həm də artıq öz nüfuzunu itirmiş!) ideoloji məqsədlə quraşdırılmış metodlarla elmi azərbaycanşünaslıq yaratmaq mümkün deyil.

Qədim dövrlərdən başlayaraq Azərbaycanda və həmhüdud regionlarda müxtəlif mənşəli etnoslar (qafqazlılar, iranlılar, türklər və b.) yaşayırlar – onlar öz dillərini, etnoqrafik xüsusiyyətlərini indiyə qədər qoruyub saxlasalar da, ölkədə aparıcı etnokulturoloji mövqe ilk orta əsrlərdən etibarən Azərbaycan türklərinə məxsusdur. Məsələ isə burasındadır ki, həmin türk etnosları Azərbaycana müəyyən bir dövr ərzində tədricən gəlib məskunlaşmış, xalq olaraq məhz burada (Azərbaycanda!), qeyri-türk etnoslarının əhatəsində formalaşmışlar. Müasir Azərbaycan dilinin, xüsusilə şimal regionlarında hun-qıpçaq tayfa dillərinin elementlərinin mövcudluğu bunu təsdiq edir. Buraya həmin regionlarda bu günə qədər mühafizə olunan bir sıra qədim hun-qıpçaq antropoloji, etnoqrafik, etnopsixoloji göstəricilərini də əlavə etmək olar. Azərbaycanda, xüsusilə onun cənubunda son türk məskunlaşmaları XVII-XVIII əsrlərə aiddir.

Azərbaycanda qədim etnik birliklər, heç şübhəsiz, olmuşdur – bunların əsasən Qafqaz, İran yaxud (Hind-İran) mənşəli olmalarını da inkar etmək çətindir. Lakin orta əsrlər boyu formalaşan Azərbaycan xalqı türk mənşəlidir, türk etnik-mədəni sisteminin üzvi tərkib hissəsidir. Azərbaycanın müxtəlif etnik mənşəli qədim mədəniyyətlərinin birbaşa deyil, dolayısı ilə varisidir: ingilislər kimi, fransızlar kimi, almanlar kimi, ruslar kimi...

Azərbaycan xalqının etnogenezi, ümumən Azərbaycanın etnik tarixi ilə bağlı məsələlərdən biri də ölkənin türkləşməsi məsələsidir ki, bu da bir çox mübahisələrin obyekti olmuş, bu gün də olmaqdadır. Məsələ bu cür qoyulur: Azərbaycanda türklər qədim dövrdən yaşayırlar, yoxsa buraya orta əsrlərdə gəlmişlər?

Görünür, qədim dövrlərdə Azərbaycanda türklər, yaxud prototürklər ya heç olmamış, ya da ölkənin mürəkkəb etnik münasibətləri sistemində diqqəti cəlb etməmişlər. Hər şeydən əvvəl, ona görə ki, e.ə. II-I

minilliklərdə türklər, yaxud prototürklər Mərkəzi Asiyanın, sonralar Türküstan adlanan geniş çöllərində məskunlaşmışdılar. Türklərin Qərbə yürüşləri, Avrasiya boyu yayılmaları eramızın ilk əsrlərində başladı ki, Azərbaycanda da türkləşmənin əsası məhz bu dövrdə qoyuldu. Bununla belə, qeyd etməliyik ki, Azərbaycanda türklərin, yaxud prototürklərin daha qədim dövrlərdən yaşadığını söyləyənlərlə yanaşı, onların bu ölkəyə II minilliyin əvvəllərində, yəni çox sonralar gəldiklərini sübut etməyə çalışanlar da vardır. Lakin araşdırmalar göstərir ki, Azərbaycanın türkləşməsi aşağıdakı mərhələlərdə getmişdir:

I mərhələ–Azərbaycanda hun-qıpçaq türklərinin yayılması (I minillik).

II mərhələ–Azərbaycanda oğuz türklərinin (II minilliyin birinci yarısı).

Azərbaycanın türkləşməsi ölkənin etnik tarixi üçün elə bir həlledici hadisədir ki, onu təfsilatı ilə öyrənmədən Azərbaycanda gedən etnik proseslərin mahiyyətini dərk etmək çətindir. Məsələnin mahiyyəti isə ondan ibarətdir ki, Azərbaycanda türklərin sayı artdıqca yerli əhali ölkənin əsasən dağlıq regionlarına təcrid olunurlar. Çünki türklər çöl həyatına adət etmişdilər... Və onların böyük mənəvi mədəniyyətini, yüksək dövlətçilik təcrübəsinin mövcudluğu artıq süqut dövrü keçirən qeyri-mütəşəkkil yerli əhalidən nəyisə öyrənməyi mümkünsüz edirdi. Xüsusilə oğuz türkləri Azərbaycanın qədim tarixinə tamamilə laqeyd idilər. Hər şeydən əvvəl, ona görə ki, İslamı qəbul etmiş, onun qılıncı missiyasını öz üzərlərinə götürmüş oğuz türkləri üçün hər hansı tarixi elə bir əhəmiyyəti yox idi, onların özlərinin tarix yaratmaq dövrü idi...

Türklər Azərbaycanda və həmhüdud regionlarda nə qədər böyük ictimai-siyasi nüfuza malik olsalar da, Qafqaz, İran və b. etnosları bilavasitə sıxışdırmadılar. Ümumiyyətlə, onlar Qərbdən Şərqə doğru yayıldıqları böyük bir dövrdə heç bir etnosa qarşı düşmənçilik münasibəti göstərməmiş, əksinə özünü yerli hesab edən xalqlarla sıx əlaqələr yaratmağa çalışmışlar. Lakin hər yerdə olduğu kimi, Azərbaycanda da passionarlıq dövrünü artıq keçirmiş qeyri-türk mənşəli müxtəlif etnoslar özlərini nəinki türklərdən, hətta həmtayfalarından belə təcrid etməyə meyilli olmuşlar. Məsələn, Qafqazlılardan udilər, buduqlar, xınalıqlar.., İran etnoslarından talışlar, tatlar...bu cür özünütəcridə nümunə ola bilərlər. Onlar sosial-mədəni, iqtisadi-təsərrüfat əlaqələrinə çox sonralar cəlb edilmişlər.

Azərbaycanda yaşayan qeyri-türk mənşəli müxtəlif etnoslar, xalqlar yalnız Azərbaycan türkcəsi əsasında deyil, eyni zamanda (və bəlkə də daha çox) Azərbaycan türklərinin tarixi birləşdiricilik missiyası əsasında ünsiyyətə girib, Azərbaycan xalqını, Azərbaycan cəmiyyətini təşkil edirlər. Bu hadisə artıq kifayət qədər zəngin tarixə malikdir... Və həmin tarixə, onun uğurlarına qarşı çıxanların aqibəti göstərdi ki, Azərbaycan xalqı etnik tərkibcə mürəkkəb olsa da, kifayət qədər bütöv, mütəşəkkildir. Lakin bir sıra etnik, mədəni problemlər vardır ki, onlar ardıcıl olaraq həll edilməli, həm Azərbaycan türklərinin, həm də Qafqaz, İran mənşəli etnosların etnoqrafiyasına, adət-ənənələrinə hörmətlə yanaşılmalı, milli münaqişə ocaqlarının yaradılmasına yol verilməməlidir. Müşahidələr göstərir ki, sivilizasiyanın yüksək səviyyədə inkişaf etdiyi regionlarda belə bu və ya digər dərəcədə narazı etnik hislər müxtəlif formalarda münaqişələr törətməyə qadirdir.

Azərbaycanlılar, başqa sözlə, Azərbaycan türkləri, məlum olduğu kimi Azərbaycan Respublikası ilə yanaşı, İranda, Türkiyədə, Rusiyada, Gürcüstanda və s. yerlərdə yaşayırlar. Belə bir faktı xatırlatmaq kifayətdir ki, İranda (Cənubi Azərbaycanda) yaşayan azərbaycanlılar Azərbaycan Res-

publikasının əhalisindən üç-dörd dəfə çoxdur, digər ölkələrdən daimi yaşayan azərbaycanlıların sayı isə yüz minlərlə, hətta milyonlarla olur. Ümumiyyətlə, dünyada əlli milyona qədər azərbaycanlı, yaxud Azərbaycan türkü mövcuddur ki, onlar eyni bir etnik kulturoloji tarixin hadisəsidir. Bununla belə, etiraf etmək lazımdır ki, əlaqəsi intensiv olmayan müxtəlif regionlarda, müxtəlif dövlətlərin ərazilərində yaşamış azərbaycanlıların etnik psixologiyasında, həyat tərzlərində, ictimai-siyasi dünyagörüşlərində, dillərində və s. müəyyən fərqlər yaranmağa başlamışdır. Bunlar xalqın, millətin bütövlüyünə mənfi təsir göstərən, onun etnik, kulturoloji kompleksini zədələyən hadisələrdir. Azərbaycan Respublikasının dünya azərbaycanlılarının birliyi uğrunda başladığı mübarizə, heç şübhəsiz, böyük ictimai-siyasi əhəmiyyətə, geniş perspektivə malikdir.

Azərbaycanşünaslıq nə dilçilik, nə ədəbiyyatşünaslıq, nə mədəniyyətşünaslıq, nə də tarixşünaslıqdır. Onun (azərbaycanşünaslığın) işi həmin elmlərin hər birinin, eləcə də bir sıra digər elmlərin faktlarından, nəticələrindən, ümumi müddəalarından istifadə etməklə Azərbaycan (və Azərbaycan xalqı!) haqqında ümumi elmi təsəvvür yaratmaqdan, Azərbaycanın (və Azərbaycan xalqının!) dünyadakı universal mövqeyini müəyyənləşdirməkdən ibarətdir. Elə etnososial, etnokulturoloji əlamətləri müəyyənləşdirmək lazımdır ki, onların məhz Azərbaycana (və Azərbaycan xalqına) mənsubluğu bir kompleks olaraq şübhə doğurmasın... Lakin bir məsələ də vardır ki, bütün bunlar Azərbaycanın (və Azərbaycan xalqının) mədəni-mənəvi, siyasi-ideoloji mənafeyinə xidmət etməlidir. Halbuki bir sıra hallarda bu və ya digər etnos, xalq məhz həmin etnosu, xalqı "idarə etmək", onun daxili işlərinə qarışmaq, gələcəyini hansısa lobbi, yaxud missioner maraqları baxımından "həll etmək" üçün öyrənilir. Bu cür kvaziazərbaycanşünaslıq, yaxud anti-azərbaycanşünaslıq böyük elmi tələblərinə cavab vermək iqtidarında olmasa da, müəyyən elmi-nəzəri, praktik problemlər yaradır ki, biz son illərdə belə problemlərlə dəfələrlə qarşılaşmalı olmuşuq. Məsələn, Azərbaycandakı etnik münasibətləri, dini problemləri, bir sıra sosial-iqtisadi məsələləri və s. öyrənib, ölkədə ictimai harmoniyanı pozmaq, etnososial destabilizasiya yaratmaq iddiasına düşmüş, hətta bəzi hallarda buna nail olmuşlar.

Sual olunur ki, azərbaycanşünaslığın metodoloji "qida mənbəyi" rolunda daha çox hansı elm sahəsi çıxış edir – türkologiya, regionşünaslıq, semitologiya, yaxud qafqazşünaslıq?

Şübhəsiz, türkologiya!...

Azərbaycan xalqının tarixi dərindən öyrənildikcə türkologiya azərbaycanşünaslığın nəinki metodoloji "qida mənbəyi"nə, bütövlükdə kompleksinə çevrilir. Və bizim fikrimizcə, azərbaycanşünaslıq getdikcə daha çox türkologiyanın üzvi tərkib hissəsi olacaqdır. Bununla belə, nə iranşünaslığı, nə semitologiyanı, nə qafqazşünaslığı azərbaycanşünaslıqdan ayrı təsəvvür etmək mümkün deyil. Azərbaycanşünaslığın elə problemləri vardır ki, həmin elm sahələrinin bilavasitə iştirakı olmadan keçinmək olmaz.

Və ümumiyyətlə, türkologiya ilə yuxarıda haqqında söhbət gedən elm sahələrinin (iranşünaslıq, semitologiya, qafqazşünaslıq və s.) əməkdaşlığı ənənəvi xarakter daşıyır, yalnız azərbaycanşünaslıqla məhdudlaşmır. Bununla belə, təcrübə göstərir ki, həmin elm sahələri Azərbaycan dili, ədəbiyyatı, mədəniyyəti ilə türkoloji konteksdən kənar olaraq "sərbəst" elmi nəticələr çıxararkən, bir qayda olaraq ciddi səhvlərə yol verirlər. Məsələn, böyük Nizaminin yaradıcılığı ilə uzun müddət yalnız iranşünaslığın məşğul olması bunu göstərdi. Şairin yaradıcılığını qədim (ümum) türk mənbələri bütünlüklə diqqətdən kənarda qaldığından onun təbliğ

etdiyi fəlsəfi-estetik ideyaların tarixi kökləri indiyəqədər müəyyənləşdirilməmiş qalmışdır. Qədim türk eposu, tanrıçılıq dünyagörüşü, Əl-Fərabi ət-Türkinin fəlsəfi görüşləri barədə aydın təsəvvürə malik olmayan bir regionşünas üçün Nizaminin poetikası, demək olar ki, anlaşılmazdır.

Azərbaycan elmi, mədəniyyəti orta əsrlərdə üç dildə-türk, ərəb və fars dillərində yaranmışdır; bu isə o deməkdir ki, azərbaycanşünaslıqda türkologiya, semitologiya və iranşünaslıq birinci növbədə mətnşünaslıq xidməti göstərmək üçündür, qafqazşünaslığın bu baxımdan funksiyası xeyli məhdud olub, yalnız bir neçə mübahisəli "alban yazısı" üzərində düşünməkdən ibarətdir. Lakin nə semitologiya, nə iranşünaslıq, nə də qafqazşünaslıq Azərbaycan mənbələri üzərində işləyərkən mətnşünaslıq işindən kənara çox çıxmamalıdır. Müşahidələr göstərir ki, həmin sahələr öz funksiyasını "genişləndirib" mətnşünaslıq fəaliyyətindən kənara çıxarkən azərbaycanşünaslığa qeyri-elmi mülahizələr gətirir, onun elmi-metodoloji əsaslarını sarsıdır.

Bununla belə, azərbaycanşünaslığın elə sahələri vardır ki, orada türkologiya həlledici söz demək hüququna malik deyil – burada, hər şeydən əvvəl, Azərbaycan tarixinin qədim (türkləşənəqədərki) dövrü nəzərdə tutulur. Belə ki, xüsusilə e.ə.III-I minilliklərdə Azərbaycanda etnik münasibətlər, mədəniyyət, sosial-siyasi proseslər barədə mötəbər sözü həmişə qafqazşünaslar, iranşünaslar demişlər, daha əvvəlki dövrlər barəsində isə, son illərdə türkoloq–altayşünaslar daha çox danışmağa başlamışlar.

Azərbaycanın dövlət müstəqilliyi qazandığı, müasir dünya ilə əlaqələrinin yaranıb inkişaf etdiyi müasir dövrdə azərbaycanşünaslığın iqtisadi, sosioloji və politoloji aspektlərinin diqqəti daha çox cəlb etməsi ənənəvi problemlərin unudulması hesabına deyil. Azərbaycanşünaslığın bir elm kimi tədqiqat hüdudları genişlənir, problemləri daha çox sosial praktikanın tələblərinə uyğunlaşır, təhlil metodları inkişaf edib zənginləşir. Və nəticə etibarilə, ənənəvi problemlərə baxışın texnologiyası da təkmilləşir.

Azərbaycanda milli dövlət quruculuğu prosesi sürətləndikcə azərbaycanşünaslığın problemləri daha bütöv, kompleks halında, biri digəri ilə qarşılıqlı əlaqədə qoyulur ki, bu, həmin problemlərin əsaslı şəkildə həlli üçün geniş ideoloji imkanlar açır...

Azərbaycanşünaslıq yalnız elmi-nəzəri, yaxud akademik bir sistem deyil, həm də get-gedə daha geniş yayılmaqda, Azərbaycan Respublikasının dövlət siyasətinə, dünyanın müxtəlif ölkələrində, təxminən 500 min kv$^2$-lik ərazisi olan tarixi Azərbaycanda məskunlaşmış azərbaycanlıların dünyagörüşünə çevrilməkdə olan azərbaycançılıq ideologiyasının elmi-metodoloji əsasıdır.

Son 15 ildə Heydər Əliyev haqqında yazılmış yüzlərlə publisistik, bədii və s. kitabları, minlərlə bu tipli məqalələri nəzərə almasaq (əslində, həmin əsərlərdə də müəyyən elmi mülahizələr tapmaq mümkündür) əliyevşünaslığın bugünə qədərki əsas mənbələrini aşağıdakı şəkildə qruplaşdırmaq olar:

1) ümummilli liderin öz əsərləri, xüsusilə nəşri mütəmadi davam edən "Heydər Əliyev. Müstəqilliyimiz əbədidir" çoxcildliyi;

2) elm adamlarının (filosof, tarixçi, hüquqşünas, iqtisadçı, filoloq, sənətşünas və b.) əliyevçiliyə həsr olunmuş əsərləri, xüsusilə akademik Ramiz Mehdiyevin fundamental araşdırmaları;

3) ictimai-siyasi xadimlərin, bir qayda olaraq, əliyevçiliyə bütövlükdə, yaxud ümumi şəkildə baxmaq təcrübəsi verən yazıları;

4) bu və ya digər elm sahələrinə, xüsusilə ictimai elmlərə həsr olunmuş monoq-

rafiya, yaxud dərsliklərdə əliyevçiliklə bağlı istinadlar, mülahizələr;

5) Heydər Əliyevin yaratdığı yeni Azərbaycan Partiyasının keçirdiyi müxtəlif səciyyəli konfranslarda edilmiş məruzələr, çıxışlar və s.

Etiraf etmək lazımdır ki, dahi ictimai - siyasi xadim, dövlət qurucusu və mütəfəkkir nə qədər böyük ideyalar müəllifi olduğunu bilsə də, sağlığında həmin ideyaların elmi - metodoloji baxımdan işlənməsi, ümumiləşdirilməsinə çalışmamış, özünəməxsus bir təvazökarlıqla bu zəruri məsələni gələcəyin (və gənc nəslin) öhdəsinə buraxmışdı. Ona yaxşı məlum idi ki, yalnız həyata keçmiş ideyalarının deyil, gələcəkdə həyata keçəcək ideyalarının da dərindən öyrənilməsi milli (və ümumbəşəri) zərurətə çevriləcəkdir. Və onu da etiraf etmək lazımdır ki, Heydər Əliyevin intellektual - elmi dühasına yüksək qiymət verən Azərbaycan alimləri keçən əsrin 90-cı illərinin ortalarından başlayaraq, əliyevşünaslığın fundamentində dayana biləcək dəyərli fikirlər söyləmiş, onun yeni keyfiyyətdə müəllifi olduğu azərbaycançılıq ideologiyasının analitik təhlilini verməyə çalışmışlar. Həm Azərbaycan əliyevşünaslığının inkişafında, həm də onun dünya miqyasına çıxmasında ümummilli liderin vəfatından sonra fəaliyyətə başlamış Heydər Əliyev Fondu böyük işlər görmüş, hətta bu sahədəki genişmiqyaslı fəaliyyətlərin koordinasiyası təcrübəsini də vermişdir və heç şübhəsiz, Heydər Əliyev Fondunun həmin təcrübəsi yaxın zamanlarda öz işinə başlayacaq Heydər Əliyev Mərkəzi üçün çox faydalı olacaqdır.

Bizim fikrimizcə, əliyevşünaslığın strukturunu, əsasən, aşağıdakı məsələlər təşkil edir ki, onların hər biri ayrıca tədqiqat sahəsi olub çoxlu sayda mütəxəssislərin birgə fəaliyyətini, əməkdaşlığını tələb edir:

I

Heydər Əliyevin elmi tərcümeyi-halı.

II

– Sovet dövründə Azərbaycan Respublikasının iqtisadi, sosial-siyasi və mədəni-mənəvi inkişafı uğrunda mübarizəsi;

– milli azadlıq və dövlət müstəqilliyi uğrunda mübarizə (1988- 1993);

– milli (və müstəqil) dövlət quruculuğu uğrunda mübarizə (1993- 1997);

– milli dövlətçiliyin möhkəmləndirilməsi uğrunda mübarizə (1997- 2003).

III

– Heydər Əliyev və Azərbaycanın dünyaya inteqrasiyası, yaxud xarici siyasəti;

– Heydər Əliyev və Azərbaycanın öz ərazi bütövlüyü uğrunda mübarizəsi;

– Heydər Əliyev və türk dünyası.

IV

– tarixşünaslıq görüşləri;
– hüquqşünaslıq görüşləri;
– iqtisadi görüşləri;
– sosioloji görüşləri;
– mədəniyyətşünaslıq görüşləri;
– dilçilik görüşləri;
– elmi-pedaqoji görüşləri və s.

V

– Heydər Əliyevin siyasətçi üslubu;
– Dövlət idarəçisi üslubu;
– Natiqlik məharəti.

VI

– Heydər Əliyevin ictimai-siyasi xadim üslubunun milli və ümumbəşəri kökləri, mənbələri;

– Azərbaycanda Heydər Əliyev məktəbi; miqyası, üslub rəngarəngliyi;

– Heydər Əliyev idarəçiliyi, xüsusilə dövlət quruculuğu təcrübəsinin davamı.

VII

– Müasir mərhələdə (2003-cü ildən sonra) Azərbaycanda Heydər Əliyev ideyalarının həyata keçirilməsi prosesi;

– Heydər Əliyev ideyalarının inkişafı;

– İlham Əliyevin idarəçilik, dövlət (və millət) quruculuğu fəaliyyəti: ənənə və novatorluq.

VIII

– Əliyevçilik Azərbaycan ictimai-siyasi fikir tarixinin üzvi tərkib hissəsi kimi;

– Əliyevçilik müasir dünya ictimai-siyasi, ideoloji fikir texnologiyaları kontekstində;

IX

Əliyevçiliyin metodoloji məsələləri.

X

Əliyevşünaslığın təbliğat və tədris-metodika məsələləri.

Bu sahələrin hər biri üzrə son on ildə müəyyən əsərlər yazılmış, maraqlı mülahizələr söylənmiş, hətta müəyyən ümumiləşdirmələr aparılmışdır, lakin ümummilli liderin, Azərbaycanın dünyaya verdiyi təfəkkür (və əməl!) dahisinin gördüyü tarixi işlər, irəli sürdüyü (və həyata vəsiqə verdiyi!) ideyalarla müqayisədə bunlar hələ ancaq başlanğıc, ilkin, uğurlu addımlar sayıla bilər. Nəzərə alsaq ki, əliyevşünaslığın (və əliyevçiliyin) bir sıra əsas müddəaları hələ də orta məktəblərin, universitetlərin tədris proqramlarında tələb olunan səviyyədə ehtiva olunmamış, regionlarda kifayət qədər yüksək zövqlə tikilmiş Heydər Əliyev muzey-mərkəzlərinin təbliğat arsenalına daxil edilməmiş, müəyyən uğurlu cəhdlərə baxmayaraq dünyanın elmi-ictimai fikir, intellekt mərkəzlərinə çatdırılmamışdır və s., onda nəinki görüləcək işlərin, hətta görülmüş işlərin belə metodiki xarakterinə, metodoloji səviyyəsinə, cəmiyyətin, xüsusilə gənclərin dünyagörüşünə təsir mexanizmlərinə hər dəfə yenidən baxmaq lazım gəlir. Dünyanın qloballaşdığı, ideya-fikir alternativliyinin mövcud olduğu və hər sahədə mövqelərin tez-tez dəyişdiyi dövrdə bütöv bir millətə azadlığın (və tərəqqinin) üfüqlərini açmış ideyaların mühafizəsi, geniş miqyasda ictimai elmi dərki olduqca zəruridir.

Zənnimizcə, əliyevçilik ən azı aşağıdakı üç kontekstdə öyrənilməlidir:

1) böyük liderin, dövlət xadiminin siyasi tərcümeyi-halı kontekstində;

2) dövrün hadisələri kontekstində;

3) Azərbaycanın gələcək taleyi kontekstində.

Lakin həmişə nəzərə almaq lazımdır ki, həmin kontekstlər bir-biri ilə sıx əlaqədədir, biri digərində ehtiva olunur, belə ki, Heydər Əliyevin siyasi tərcümeyi-halı dövrün hadisələrindən, bu hadisələrlə birlikdə Azərbaycanın gələcək taleyindən ayrılmazdır. Və onu da nəzərə almaq lazımdır ki, əliyevçilik hərəkətdə olan azərbaycançılıqdır – xalqımızın və dövlətçiliyimizin ən yeni tarixinin (və perspektivlərinin) ideologiyasını verməklə əvəzsiz metafizik dəyər daşıyır… Bununla yanaşı, əliyevşünaslığın bir problemi də dövrün müxalif ideyalarının, daha doğrusu, iddialarının öyrənilməsindən ibarətdir ki, həmin problem diqqətdən kənarda qalarsa, əliyevçiliyin hansı mübarizələr mühitində formalaşması kimi mühüm məsələ unudular.

Heç də o qədər kiçik olmayan problemlərdən biri də elm adamlarının əliyevşünaslığın

a) milli və ümumbəşəri;

b) humanist və ya demokratik;

c) fərdi və ya ictimai

məzmununu Azərbaycan cəmiyyətinin anlayacağı bir dillə çatdırmaq lazımdır. Elmi-intellektual mühitimizin adət etdiyi kanonlarla, xüsusilə marksist-metodoloji texnologiyalarla əliyevşünaslığı dərk (və izah) etmək mümkün olmayacaqdır. Bu istiqamətdə də akademik Ramiz Mehdiyevin təklif etdiyi üsullara önəm vermək ehtiyacı hiss olunur…

Əlbəttə, əliyevşünaslığın bir elm kimi inkişafı Azərbaycanın ictimai-siyasi fikir tarixinin müasir mərhələsi olan əliyevçiliyin bir ideologiya kimi inkişafına istinad edir.

***Təhsil islahatı fəaliyyətdədir***

# AZƏRBAYCANDA MAKARENKONUN PEDAQOJİ İRSİNİN YAYILMASI

**Fərrux Rüstəmov**
***pedaqoji elmlər doktoru, professor,***
***əməkdar elm xadimi***

Azərbaycanda Qərb və Şərq alimlərinin pedaqoji irsinin yayılması həmişə diqqət mərkəzində olmuşdur. Azərbaycan pedaqoji fikrində dünyanın ən məşhur pedaqoqları tez-tez xatırlanmış, yeri gəldikcə onlara istinad olunmuşdur.

Sovet məktəb və pedaqogikasının inkişafında Anton Semyonoviç Makarenkonun (1888-1939) müstəsna xidmətləri var. Poltava Müəllimlər İnstitutunu qızıl medalla bitirən A.S.Makarenko 1917-ci il sentyabrın 1-də Kryukova ibtidai məktəb müfəttişi vəzifəsinə təyin olundu. 1920-ci ildə Poltava quberniya maarif şöbəsi Makarenkonu qanun pozan uşaqlar və yeniyetmələr koloniyasına müdir təyin etdi. Az sonra bu koloniyaya M.Qorkinin adı verildi. 1926-cı ilin mayında bu koloniya bərbad halda olan Kuryajdakı koloniya ilə birləşməli oldu. Bunun üçün koloniya Kuryaja köçdü. Makarenkonun koloniyasında 150-ə yaxın uşaq olduğu halda, Kuryajdakı koloniyada 280 uşaq vardı. Makarenkonun Qorki adına koloniyadan gətirdiyi yaxşı ənənələrin dağılması və çoxluqda olan kuryacların təsiri altına düşüb əriməsi qorxusu vardı. Lakin Makarenkonun çox incə, psixoloji cəhətdən dəqiq düşünülmüş pedaqoji taktı və tədbirlər sistemi bu çətinliyə qalib gəldi. 1927-ci ildə Ukrayna çekistlərinin toplamış olduğu vəsait hesabına Dzerjinskiyə xatirə olaraq onun adına yurdsuz uşaqlar üçün bir kommuna təşkil etmək qərara alındı. 1927-ci ilin axırlarında kommunanın rəsmi açılışı oldu. Ona rəhbərlik A.S.Makarenkoya tapşırıldı. Elə həmin vaxt Ukraynada böyük şöhrət qazanan A.S.Makarenkonun iş üsuluna ciddi hücumlar başlandı. 1928-ci ilin yayında Ukrayna XMK-nın elmi şurasında mühafizəkar pedaqoqların təsiri ilə A.S.Makarenkonun tərbiyə sisteminin guya "qeyri-sovet" sistemi olması haqqında biabırçı qərar çıxarıldı. A.S.Makarenko öz şöhrəti və M.Qorkinin köməyi ilə bu sıxıntıdan və məhv olmaq təhlükəsindən xilas oldu. Öz fəaliyyətini Dzerjinski adına kommunada davam etdirdi. 1928-35-ci illərdə burada çalışan A.S.Makarenko Ukraynanın əmək koloniyalarının tədris-tərbiyə hissəsinə müdir təyin edildiyindən Kiyevə köçdü. Sonra isə M.Qorkinin məsləhəti ilə Moskvaya köçüb, ədəbi fəaliyyətlə məşğul oldu. Moskvada onun öz təcrübələri əsasında qələmə aldığı "Pedaqoji poema" (1933-1937), "Valideynlər üçün kitab" (1937), "Qüllələr üzərində bayraqlar" kitabları nəşr olundu.

1930-cu illərin əvvəllərində ölkədə cərəyan edən siyasi hadisələr A.S.Makarenkodan yan ötmür. Bədxahları ondan əl çəkmək istəmir, onun fiziki məhvinə çalışırdılar. Predmetsiz mübahisələr genişlənir, həqiqətə gedən yollar "nəzəri" iddialarla daha da dolaşdırılırdı. A.S.Makarenkonun tərbiyə sisteminin "qeyri-sovet" sistemi olması haqqında

mühafizəkarların çıxardığı qərar onun fiziki cəhətdən məhvinə hesablanmışdı. Moskvada A.P.Pinkeviçin, P.P.Plonskinin başına gətirilənlər, Bakıda B.B.Komoravski, A.O.Makovelski, Ə.Zəkuzadə, Ukraynada A.S.Makarenko üçün təkrarlanırdı. Hədə, təhqir və yalanlara cavab vermənin fiziki cəhətdən məhvə səbəb olacağını dərk edən bu insanlar "öz səhvləri" barədə etiraf məktubları yazır, özlərini əsassız ittihamlardan qorumaq üçün ən düzgün elmi mövqelərini tənqid etməli olurdular.

30-cu illərdə demokratik naqislik, yad fikirliliyə dözməzlik, ümumbəşəri əxlaq normalarının deformasiyası, cəmiyyətin təbii vəziyyətinin səciyyəvi xüsusiyyətləri idi. Yadfikirlilik, başqa cür düşünmək – casusluğa, ziyankarlığa, vətənə xəyanətə bərabər tutulurdu. Cəmiyyət sosial-siyasi, mədəni-psixoloji şəraitin təsiri üzündən bürokratik avtoritarizmin əsirinə, sovet totalitar rejimi təfəkkür sahiblərinin qəniminə çevrilmişdi. Pedaqoji diskussiyalar siyasi demoqogiya və sinfi düşmən axtarışı kimi yanlış tendensiyanın təsiri ilə baş verirdi. A.S.Makarenko yaxşı başa düşürdü ki, ona qarşı irəli sürülən ittihamlar onun fiziki cəhətdən məhvinə hesablanıb. Yeni sosialist mədəniyyətinin formalaşdırılması və sadə xalqın ona cəlb edilməsi ideyasının baş ideoloqlarından olan N.K.Krupskaya ilə onun arasında yaranan narazılıq da təsirsiz ötüşmədi. O, M.Qorkinin köməyi ilə Moskvaya köçdü, burada ədəbi fəaliyyətə başladı. Öz zəngin pedaqoji təcrübəsini ümumiləşdirərək elmi – pedaqoji məqalələr yazdı, məruzələrlə çıxış etdi, radio ilə ailə tərbiyəsinin mühüm məsələlərinə dair dəyərli məruzələr oxudu. Moskvada yaşadığı iki il onun üçün olduqca məhsuldar oldu. Həmin illərdə o, SSRİ Ali Sovetinin Fəxri fərmanı və Qırmızı əmək bayrağı ordeni ilə təltif edildi. Cismani terrordan, Sibirə sürgündən yaxa qurtaran A.S.Makarenko mə-nəvi terrordan yan keçə bilmədi. 16 il fasiləsiz və istirahətsiz əmək, uşaq koloniyasında və əmək kommunasında gərgin iş, böyük yaradıcılıq fəaliyyəti, psixoloji təzyiq, Fransada yaşayan qardaşı ilə bağlı keçirdiyi əsəb və sarsıntı onun 51 yaşında qəflətən vəfatına səbəb oldu. Vəfatından sonra onu müayinə edən həkimlər ürəyinin alma kimi ikiyə bölündüyünü görəndə dəhşətə gəldilər. O, ancaq və ancaq ölümü ilə repressiyadan, siyasi və psixoloji təzyiqdən yaxa qurtara bildi.

A.S.Makarenko ölümündən sonra məşhurlaşdı. Nəinki keçmiş SSRİ-də, hətta xaricdə onun haqqında tədqiqatlar meydana gəldi, əsərləri Ruminiya, Polşa, Çexoslovakiya, Almaniya, Latın Amerikası və Bolqarıstanda nəşr olundu.

1940-cı ildən başlayaraq Azərbaycan pedaqoji ictimaiyyəti onun nəzəri irsi ilə tanış olmağa başladı. Əsərləri Azərbaycan dilinə tərcümə edildi. Onun "Ata-analar üçün leksiyalar" (1941), "Tərbiyə işinin metodikası" (1948), "Kommunist tərbiyəsi haqqında" (1954), "Pedaqoji poema" (1953), "Valideynlər üçün kitab" (1964), "Seçilmiş pedaqoji əsərləri" (1950, 1983, 1988) Azərbaycan dilində nəşr olundu. Haqqında B.B.Komarovskinin "A.S.Makarenkonun yeni insan tərbiyəsi proqramı haqqında" (1951), Ə.Seyidovun "A.S.Makarenko novator pedaqoqdur" (1949), Ə.Tağıyevin "A.S.Makarenkonun fiziki tərbiyə haqqında fikirlərinə dair" (1959), P.Landesmanın "A.S.Makarenkonun pedaqoji irsində etika məsələləri" (1960), T.Əfəndiyevin "A.S.Makarenkonun yaxın köməkçiləri" (1963), M.Məhərrəmovun "A.S.Makarenko iradə tərbiyəsi haqqında" (1972), S.Axundovun "A.S.Makarenko uşaqlara fərdi yanaşma haqqında" (1972), X.Fətəliyevin "A.S.Makarenkonun hərbi vətənpərvərlik tərbiyəsi sistemi" (1973), A.Zeynalovun "A.S.Makarenkonun pedaqoji fəaliyyətində Qorki optimizmi" (1977), H.Əhmədovun "A.S.

Makarenko və Azərbaycan" (1968), "A.S.Makarenkonun pedaqoji irsi Azərbaycan məktəbi və pedaqogikasının tükənməz mənbəyidir" (1988), S.S.Məcidov və Ə.Ağayevin "A.S.Makarenkonun pedaqoji irsinin saxtalaşdırılmasına dair" (1985), Ə.Əlizadənin "A.S. Makarenko ailə tərbiyəsi haqqında" (1988), Y.Talıbovun "A.S.Makarenko uşaq kollektivinin təşkili və tərbiyəçisi haqqında (1988), Ə.Ağayevin "A.S.Makarenkonun pedaqoji ideyalarından yenidənqurma şəraitində məktəblərdə istifadə edilməsi imkanları" (1988), Ə.Tağıyev və M.İsmixanovun "A.S.Makarenko uşaq kollektivində ənənələrin rolu haqqında" (1988) ciddi elmi məqalələri nəşr olunmuşdur.

Keçən əsrin 80-ci illərində prof. Ə.Ağayev A.S.Makarenkonun iki cildlik "Seçilmiş pedaqoji əsərləri"ni nəşr etdirmişdir.

Prof. Ə.Seyidovun və prof. F.Rüstəmovun ayrı-ayrı illərdə nəşr etdirdikləri "Pedaqogika tarixi" dərsliklərində onun pedaqogikanın elmi–nəzəri, metodoloji və praktiki problemləri ilə bağlı fikir və mülahizələri sistemləşdirilmiş, pedaqoji sistemin mahiyyətinə aydınlıq gətirilmişdir. Onun pedaqoji sisteminin əsas tələbi – kollektivdə, kollektiv vasitəsilə, kollektiv üçün tərbiyə prinsipidir. O deyirdi ki, bizim tərbiyənin əsas vasitəsi ilk öncə kollektivi təşkil və tərbiyə etməkdir. Tərbiyə nəzəriyyəsinin inkişafında onun "paralel təhsil" və "perspektiv xətlər sistemi" mühüm yer tutur. Humanizm və insanlara qayğı, şəxsi əmək onun tərbiyə nəzəriyyəsinin metodoloji əsasını təşkil edir.

A.S.Makarenkonun pedaqoji sisteminin Azərbaycanda sistemli və ardıcıl tədqiqi prof. M.Muradxanovun adı ilə bağlıdır. M.Muradxanov Azərbaycanda tərbiyə nəzəriyyəsinin inkişafında müstəsna xidmətləri olan alimlərdən biridir. Onun pedaqogikanın nəzəriyyəsi və tarixi ilə bağlı 40 kitab, kitabça və monoqrafiyası, xeyli elmi-metodik məqaləsi nəşr olunmuşdur. O, A.S.Makarenko ilə bağlı araşdırmalarını "A.S.Makarenko ailə tərbiyəsi haqqında" (1957), "A.S.Makarenkonun pedaqoji irsi və ondan Azərbaycanda istifadə edilməsi təcrübələri" (1965) adlı monoqrafiyalarında, "A.S.Makarenkonun pedaqoji irsindən istifadə etməyə dair" (1951), "A.S.Makarenkonun tərbiyə müəssisələrində əmək məsələləri" (1958), "A.S.Makarenko pedaqogikanın metodoloji əsasları haqqında" (1963), "A.S. Makarenko tərbiyənin mahiyyəti haqqında" (1965) və s. məqalələrində ümumiləşdirmişdir.

"A.S.Makarenko ailə tərbiyəsi haqqında" (1957) adlı kitabında M.Muradxanov A.S.Makarenkonun pedaqoji irsində əmək tərbiyəsi problemini araşdırmış, insanın tərbiyə və yenidəntərbiyə edilməsində əməyin rolu ilə bağlı mütəfəkkir pedaqoqun ideyalarını sistemləşdirmişdir. "A.S.Makarenkonun pedaqoji irsi və ondan Azərbaycanda istifadə edilməsi təcrübələri" (1965) adlı əsəri həm həcmcə, həm də əhatə etdiyi problematikaya görə daha fundamentaldır. Monoqrafiya "Bir neçə söz" və yeddi fəsildən ibarətdir. İlk fəsil A.S.Makarenkonun həyatı və pedaqoji fəaliyyətinə həsr olunub. Burada o, A.S.Makarenkonun yaşadığı dövrün ictimai-siyasi xarakteristikasını vermiş, onun həyatı və yaradıcılığının ən mühüm məqamlarını tədqiqata cəlb etmiş, 1960-cı ilə qədər onunla bağlı yazılan əsərlərə münasibət bildirmişdir.

İkinci fəsil sırf nəzəri xarakter daşıyır, burada A.S.Makarenkonun sovet pedaqogikasının metodoloji əsasları ilə bağlı ideyaları tədqiq olunur. Yeni insanın köhnə üsullarla tərbiyə edilə bilmədiyini hiss edən A.S.Makarenko köhnə pedaqoji irsə tənqidi yanaşmış, pedaqoji kollektivdə uşaqları yeni əsaslarda tərbiyə etmək üçün yollar axtarmış, yeni şəxsiyyət tərbiyəsi üçün səmərəli üsullar tətbiq etmişdir. O, bəzi pedaqoqlar kimi daha humanist və demokratik xarakter daşıyan klassik ideyaları inkar etməmiş, hər

cür idealizmin və metafizikanın əleyhinə çıxmış, sələflərinin pedaqoji ideyalarını cəmiyyətin tələbləri baxımından qiymətləndirmiş və onu dəyərləndirmişdir. Pedaqogikada nəzəriyyə ilə təcrübənin vəhdətini zəruri hesab edən A.S.Makarenko bu elmin ilk növbədə praktik pedaqoqlara xidmət etməli olduğunu qeyd edirdi. M.Muradxanov A.S.Makarenkonun pedaqoji irsində pedaqogikanın metodoloji məsələlərini araşdırarkən irəli sürülən fikirləri həm xarici, həm də rus alimlərinin fikirləri kontekstində təqdim etməklə, onun uğurlu cəhətlərini təqdir edir. Monoqrafiyanın üçüncü fəsli tərbiyənin məqsədinin aydınlaşdırılmasına yönəldilmişdir. A.S.Makarenko tərbiyə məqsədinin, hər şeydən əvvəl, hər kəs üçün anlaşılan və insan şəxsiyyətinin proyekti kimi yerinə yetirilə bilən praktik kateqoriya olduğunu xüsusi qeyd edir və məqsəd əvəzinə irəli sürülən idealdan əməli tərbiyə işində istifadə etmənin mümkün olmadığını göstərirdi. O, fikrini aydın şərh edərək yazırdı: "Tərbiyənin məqsədindən danışarkən mən insan şəxsiyyətinin proqramını, insan xarakterinin proqramını nəzərdə tuturam, həm də xarakter məfhumunu şəxsiyyətin bütün məzmunu kimi, yəni həm zahiri hərəkətlərdə özünü göstərən xarakter kimi, həm də daxili əqidə kimi, həm siyasi tərbiyə və bilik kimi başa düşürəm. Beləliklə, insan şəxsiyyətinin bütün mənzərəsi kimi nəzərdə tuturam…"

Fəsildə M.Muradxanov A.S.Makarenkonun yeni insan tərbiyəsi ilə bağlı irəli sürdüyü proqramın mahiyyətinə aydınlıq gətirmiş, onun spesifik cəhətlərini (hər bir kəsin orta təhsil alması, peşə alması, əxlaq tərbiyəsində kollektivçilik keyfiyyətinə xüsusi yer verilməsi) önə çəkmiş, həm hamı üçün vahid olan ümumi tərbiyə məqsədini, həm də hər uşaq üçün onun qabiliyyətindən və istedadından asılı olaraq əlavə tərbiyə məqsədinin həyata keçirilməsinin yollarını araşdırmışdır.

Əxlaq tərbiyəsinin mahiyyəti, prinsip və üsulları monoqrafiyanın dördüncü fəslində tədqiqat predmetinə çevrilmişdir. Burada A.S.Makarenkonun tərbiyənin mahiyyəti və prinsipləri haqqında fikirləri ümumiləşdirilmiş, klassik pedaqoqların ideyaları kontekstində müqayisəli şəkildə təhlil olunmuş, əhəmiyyətliliyi üzə çıxarılmış, onun tərbiyə müəssisələrində daha çox istifadə etdiyi metodların (inandırma, alışdırma, rəğbətləndirmə və cəzalandırma) mahiyyətinə aydınlıq gətirilmişdir. M.Muradxanov A.S.Makarenkonun əsas tutduğu prinsipləri, xüsusilə tərbiyədə hərtərəfli təsir prinsipini və kollektivdə kollektiv vasitəsilə tərbiyə prinsipini izah edərkən fikrini Azərbaycan məktəblərindən götürdüyü zəngin təcrübə ilə əsaslandırmışdır. Uşaq kollektivinin təşkili və tərbiyəsi A.S.Makarenkonun pedaqoji irsində mühüm yer tutur. Ona görə də M.Muradxanov ilk öncə A.S.Makarenkonun kollektivin təşkilinin ümumi əsasları ilə bağlı fikirlərini təhlil etmiş, ilk kollektivlərin təşkili prinsiplərini müəyyənləşdirmiş, buradakı işin xüsusiyyətlərinə aydınlıq gətirmiş, ümummüəssisə kollektivinin təşkili və işinin mahiyyətini şərh etmiş, tərbiyə işində o dövrdə çox böyük siyasi gücə, nüfuza malik olan komsomol təşkilatının fəaliyyətini aydınlaşdırmış, kollektivin tərbiyəsində perspektiv xətlərin, ənənələrin və fəalların işinin spesifik cəhətlərini üzə çıxarmışdır.

A.S.Makarenkonun pedaqoji irsində əmək tərbiyəsi məsələləri mühüm yer tutur. O, uşaqların tərbiyəsində əməyin böyük rolunu dərk edərək, özünün rəhbərlik etdiyi müəssisələrdə müxtəlif şəkillərdə uşaq əməyini təşkil etmiş, onun tərbiyəvi təsirini, gücləndirməyin yollarını tədqiq etmişdir. M.Muradxanov A.S.Makarenkonun uşaqları əmək prosesində tərbiyə etməklə bağlı fikirlərini həm Azərbaycan, həm də rus pe-

daqoqlarının fikirləri ilə müqayisəli şəkildə təhlil etmiş, onun əmək tərbiyəsinin əhəmiyyəti, koloniya və kommunada uşaq əməyinin xarakteri və təşkili metodikası ilə bağlı fikirlərini sistemləşdirmiş, özünəxidmət, kənd təsərrüfatı, istehsalat emalatxanası və zavodda uşaq əməyinin təşkili metodikası ilə bağlı ideyalarını üzə çıxarmış, məktəblə istehsalat arasındakı əlaqənin mexanizmini açmış, həmin ideyalardan yaradıcılıqla istifadə etməyin mümkünlüyünü əsaslandırmışdır.

A.S.Makarenkonun pedaqoji irsində uşaq oyunları haqqında dəyərli fikirlər vardır. O, uşaq oyunun mahiyyəti, ayrı-ayrı yaşlarda uşaq həyatında oyunun tutduğu mövqe, müxtəlif yaşlarda uşaq oyunlarının təşkili və onlara pedaqoji rəhbərliklə bağlı məsələləri araşdırmışdır. M.Muradxanov A.S.Makarenkonun uşaq oyunları ilə bağlı fikirlərini təhlil etmiş, uşağın oynaması ilə əsl iş arasındakı oxşarlıq və fərqli cəhətləri göstərmiş, uşaqların inkişafını tədricən oyundan əməyə keçmək kimi xarakterizə etmiş, məktəbəqədər və məktəb dövründə uşaq oyununun mərhələlərini müəyyənləşdirmiş, oyuna rəhbərliyin təkmilləşdirilməsi aspektlərinə toxunmuş, uşaq həyatının oyun kimi təşkilinin xüsusiyyətlərini və üstünlüklərini izah etmişdir. Əsaslandırmışdır ki, uşaq oyunlarının mahiyyəti, müxtəlif yaş dövrlərində uşaq oyununun xarakteri, oyuncaqların təsnifatı və uşaq oyununa tərbiyəçilərin rəhbərliyi haqqında A.S.Makarenkonun əsaslı və dolğun fikirləri pedaqogika elminin bu sahəsini xeyli zənginləşdirmişdir.

M.Muradxanovun keçən əsrin 60-cı illərində apardığı bu araşdırmalar Azərbaycanda pedaqogikanın metodoloji problemlərinin araşdırılmasında, tərbiyə nəzəriyyəsinin (xüsusilə əxlaq və əmək) inkişafında, uşaq kollektivinin təşkili və tərbiyəsində müstəsna rol oynamışdır.

Azərbaycanda A.S.Makarenkonun şəxsiyyətinə və pedaqoji irsinə həmişə güclü maraq olmuş, onun yüzillik yubileyi təntənə ilə keçirilmişdir. Bu yaxınlarda isə akademik Hüseyn Əhmədovun təşəbbüsü ilə A.S.Makarenkonun anadan olmasının 125 illiyi münasibətilə Azərbaycan Dövlət Pedaqoji Universiteti və Təhsil Problemləri İnstitutu birgə elmi seminar keçirmişdir. Seminarda akademik H.Əhmədov "A.S.Makarenko və Azərbaycan", prof. F.Rüstəmov "A.S.Makarenkonun tanınmış tədqiqatçısı Mərdan Muradxanov", prof. R.Əliyev "A.S.Makarenkonun psixoloji ideyaları", prof. İ.İsayev "A.S.Makarenko ailə tərbiyəsi haqqında", pedaqoji elmlər doktoru M.İlyasov "A.S.Makarenkonun pedaqoji ideyalarında peşəyönümü problemi" mövzularında məruzələr etmiş, böyük pedaqoqun nəzəri-pedaqoji irsinin müasir dövrdə də təhsil – tərbiyə nəzəriyyəsinin inkişafına təsiri imkanlarını araşdırmışlar. Xüsusi qeyd etmək lazımdır ki, A.S.Makarenkonun pedaqoji irsinə indi nəinki keçmiş SSRİ ölkələrində, həm də uzaq xaricdə maraq daha böyükdür. Rusiya, Ukrayna və İtaliyada A.S.Makarenko assosiasiyası fəaliyyət göstərir, əsərləri xarici dillərə tərcümə olunur.

**İstifadə edilmiş ədəbiyyat**

1. Muradxanov M. A.S.Makarenkonun pedaqoji irsi və ondan Azərbaycanda istifadə edilməsi təcrübələri. Bakı, 1965.

2. Əhmədov H. A.S.Makarenko və Azərbaycan // Azərbaycan müəllimi qəzeti, 15 mart, 2013-cü il, № 10.

3. Rüstəmov F. Azərbaycanda pedaqoji elm: təşəkkülü, inkişafı və problemləri (1920-1991-ci illər). Bakı, 1998.

4. Rüstəmov F. Azərbaycan pedaqoji biblioqrafiyası: məktəb və pedaqogika tarixinə dair ədəbiyyat (1940-1990-cı illər). Bakı, 1995.

minin yaradılmasında testlərin elmi cəhətdən düzgün tərtib edilməsinin mühüm əhəmiyyəti var. Bu məqsədlə universitetlərdə hazırlanan testlər testologiya elminin prinsiplərinə əsaslanmalıdır. İnnovasion cəmiyyət şəraitində bir çox ixtisaslarda, xüsusən də mühəndis hazırlığında kreativ bilik və bacarıqların formalaşması mühümdür. Bunun nəticəsində elmi-texniki və texnoloji məsələləri orjinal həll etmək, mövcud texniki həllərdəki nöqsan və ziddiyyətləri görmək və onları həll etmək mümkündür. Biliklərin qiymətləndirilməsinin reytinq sistemində tələbələrin müstəqil şəkildə biliklərin axtarılması, mənimsənilməsi, tətbiqi və fəal tədris fəaliyyətinin formalaşdırılması mühümdür. Tələbənin fəal, müstəqil idrak prosesinə cəlb edilməsi, peşə fəaliyyətinin uğurlu formalaşdırılması o zaman səmərəli ola bilər ki, təlim sistemi tədris fənlərini horizontal (bir kurs daxilində) və vertikal (kursdan kursa keçidlə) olaraq əhatə etsin. Bu zaman fənlərarası əlaqə yaradılır, hər bir kafedranın maraqları təmin edilir.

Göründüyü kimi, ali təhsilin keyfiyyəti çox ciddi planlaşdırma və idarəetmə tələb edir, bu prosesdə yaranan yeni tendensiyalar daim öyrənilməli və tətbiq edilməlidir. Bu tendensiyaların izlənilməsi universitetlər arasında olan qlobal rəqabətin əsas şərtlərindən biridir. Milli universitetlərimizdə keyfiyyət və planlaşdırma ilə əlaqədar bu tip innovasion ideyaların, müvafiq layihələrin reallaşmasına ehtiyac var. Bu layihələrin nəticəvi olması üçün isə onların zəruri resurslarla təmin edilməsi mühümdür. Çünki, “….təhsil millətin gələcəyidir” (H.Əliyev).

*Rəyçi: ped.e.d. dosent. İsa İsmayılov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Əhmədov B., Rzayev A. Pedaqogikadan mühazirə konspektləri. Bakı, 1982.

2. Əhmədov İ. Milli universitetlərdə keyfiyyətin idarəedilməsi problemləri. Təhsildə İKT. ADPU, Bakı, 2011, № 1.

5. Məmmədzadə R. Təhsildə keyfiyyət aparıcı istiqamətlərdən biri kimi, Bakı: Müəllim, 2010.

8. Факторович А. “Управление качеством образовательного процесса в современном вузе”. Журнал “Педагогика”, № 3, 2009, стр.80-83.

**И.Ахмедов**

**Новые тенденции в планировании, управлении и измерении качества образования**

**Резюме**

Одним из основных целей образовательного процесса является обеспечение его качества. Качество непрерывного образования зависит от многих параметров. Повышение качества образования не может произойти стихийно, этот процесс нуждается в управлении, прогнозировании, тщательном планировании и систематическом контроле. По этим причинам к управлению качеством образования применяют процессный подход. В статье указываются основные направления планирования качества образования в университетах, в этом контексте каждое направление анализируется отдельно.

**I.Ahmadov**

**New tendencies in planning, managing and assessing the quality of education**

**Summary**

The quality of education is one of the main factors to reach goals. Continuous educational process and its quality depend on the number of factors. Therefore enhancing the quality of education shouldn’t be spontaneous; this process should be managed, planned and controlled systematically. For this reason while planning the quality of training following directions must be taken into consideration.

# TƏHSİLDƏ MİLLİLİK PRİNSİPİNİN YERİ

**Pərişan Həsənova**
***ARTPİ-nin elmi işçisi***
***perisanhesenova@gmail.com***

***Açar sözlər:*** *millilik prinsipi, milli dövlətçilik, milli-mənəvi və ümumbəşəri dəyərlər.*
***Ключовые слова:*** *принцип национализма, национальная государственность, национально-моральные и общечеловечные ценности.*
***Key words:*** *national principles, national statehood, national-moral and universal values.*

Təhsilin prinsipləri təhsil-tərbiyənin məqsədləri ilə müəyyən olunur və tarixi xarakter daşıyır. Onun əsas vəzifələrindən biri intellektual səviyyə ilə yanaşı, həm də insanın sosial və mənəvi inkişafına təkan verməkdir. Müasir təhsilin konseptual problemlərindən biri təhsilin inkişafetdirici və tərbiyəedici mahiyyətini dəyərləndirməkdir. Belə ki, müasir təhsil konsepsiyasında sərbəst düşüncə tərzinə malik, müstəqil, azad, demokratik baxışlı Azərbaycan vətəndaşlarının milli ruhda tərbiyəsi mühüm məna kəsb edir. Düzdür milli tərbiyə konsepsiyası hələ tam mənada müəyyənləşdirilməmişdir. Lakin qədim tarixi, zəngin milli-mənəvi dəyərləri olan xalqımızın deyimləri, duyumları, milli mədəniyyət abidələri, incəsənəti ilə yanaşı, milli ruhu özündə yaşadan mənbələrimiz vardır. Xalqımızın böyük oğlu, ulu öndər Heydər Əliyevin Azərbaycan xalqı üçün qoyub getdiyi qiymətli irs mənəvi tərbiyəni, eləcə də milli mənəviyyatımızı zənginləşdirə biləcək dəyərli mənbədir. "Heydər Əliyev cənablarının çıxışları, nitqləri və məruzələrində irəli sürülən tərbiyəvi baxımdan qiymətli fikirlər tərbiyə işinin həm məzmununu, həm də həyata keçirilmə yollarını müəyyənləşdirir, milli tərbiyə konsepsiyasının müddəalarını ortaya qoyur" (3, 205). Cəmiyyətin gələcək tərəqqisini gənclərimizin mükəmməl təhsil almasında görən ulu öndər deyirdi: "Cəmiyyətin gələcək tərəqqisi bir çox cəhətdən indi gənclərimizə nəyi və necə öyrətməyimizdən asılı olacaqdır. Əlbəttə, bu da təhsil sistemimizin qabaqcıl dünya dövlətlərinin təhsil sisteminə inteqrasiyası, təhsilin modernləşdirilməsi yolu ilə həyata keçə bilər. Müstəqil dövlətimizi möhkəmləndirmək üçün müasir gəncliyə elmi-texniki biliklər vermək, praktik vərdişlər mənimsətmək bacarıqları ilə yanaşı, milli-mənəvi dəyərlərə malik olmaq, milli xüsusiyyətlərinə hörmətlə yanaşmaq kimi hislər də aşılamaq lazımdır. Ulu öndər dönə-dönə bildirirdi ki, gənclərimiz milli ruhda tərbiyə olunmalıdır, milli-mənəvi dəyərlərimiz əsasında tərbiyələnməlidir, tariximizi, dilimizi, milli ənənələrimizi, milli dəyərlərimizi yaxşı bilməlidir. Mənəviyyat olmayan yerdə heç bir şey ola bilməz... Bu gün mənəvi tərbiyə, bəlkə də, keçmiş illərdən daha çox lazımdır (2,357-358).

Milli-mənəvi dəyərlərin qorunub saxlanılması və inkişafına ulu öndərin irəli sürdüyü konseptual baxışla yanaşsaq, müəyyən etmək olar ki, milli ruhun inkişafı üçün, milli-mənəvi dəyərlərin, adət-ənənələrin yeni nəslə çatdırılması və davam etdirilməsi üçün bir neçə şərtlərin:

O cümlədən milli dövlətçiliyin qorun-

ması və ona məhəbbət, ana dilinin qorunması və onun təbliği, hüquqi dövlətin Əsas Qanunu, onun bayrağı, himni, gerbi və başqa atributlarına hörmət və qorunması, milli sərvətlərin qorunması və onlara qayğı, dini dəyərlərə hörmət və b. olması vacibdir.

Aydındır ki, hər bir xalqın özünü təsdiqi üçün onun müstəqilliyini, azad, demokratik bir mühitdə yaşamasını təsdiq və təmin edə biləcək güclü dövləti, bu dövlətin rəmzi olan atributları, onun fəaliyyətini tənzimləyəcək Əsas Qanunu, dili, dini dəyərləri olmalıdır. Yalnız güclü, qüdrətli dövlət xalqın azad yaşamasının təminatçısı ola bilər, xalqını maddi və mənəvi sərvətlərinin əsl sahibi edə bilər, onun dilini, milli-mənəvi dəyərlərini yaşada bilər. Bunun üçün ilk növbədə: "Hər bir Azərbaycan gənci öz həyat yolunu müstəqil Azərbaycan Respublikasının gələcək yolu kimi qəbul etməli, öz fəaliyyətini Azərbaycan Respublikasının yaşamasına və əbədi olmasına həsr etməyə hazır olmalıdır. Vətənini, torpağını, dövlətini, müstəqil Azərbaycanı qorumağı öz ata-anasını, evini qorumaq kimi başa düşməlidir.

Cəmiyyətin əsas ünsiyyət vasitəsi olan dil millətin milliliyinin saxlanılması şərti hesab olunur. Xalqın milliliyini, mənəvi dəyərlərini, mədəniyyətini məhz dil yaşadır və inkişaf etdirir. "Azərbaycan dilinin dövlət dili kimi yaşaması, möhkəmlənməsi, inkişaf etməsi də bizim ən böyük nailiyyətlərimizdən biridir. Bu, təkcə dil məsələsi deyil, həm də azərbaycançılıq məsələsidir" (1,13-18).

Türkdilli xalqlarının qədim, çoxəsrlik tarixi boyu Avrasiya qitəsinin böyük hissəsində yaşayaraq dünya, bəşər mədəniyyətinə böyük töhfələr vermiş, onu zənginləşdirmiş olan dili də bizim üçün əzizdir. Tarix boyu türkdilli xalqlar cürbəcür müharibələrlə, döyüşlərlə, təcavüzlərlə rastlaşmışlar. Ancaq xalqlarımızın dərin kökləri, bir-birinə mənəvi bağlılığı onları bütün bu mərhələlərdən, imtahanlardan, sınaqlardan bugünkü günlərə gətirib çıxarmışdır. Biz öz tarixi köklərimizlə, milli köklərimizlə, mənəvi dəyərlərimizlə, milli-mənəvi ənənələrimizlə, böyük tariximizlə fəxr edə bilərik.

Dövlətçilik, milli müstəqillik, ana dilinin mövqelərinin möhkəmləndirilməsi, dini və milli dəyərlərə hörmət, milli sərvətləri qorumaq kimi məsələlər Azərbaycançılıq prinsiplərinin əsasını təşkil edir. Çünki "Keçmiş dövrlərdə, keçmiş əsrlərdə Azərbaycanın dövlətləri daha da geniş ərazidə olmuşlar. İndi bizim Azərbaycandan savayı, dünyanın çox ölkələrində azərbaycanlılar yaşayır. Onlar da azərbaycanlıdırlar, onlarda da azərbaycançılıq hisləri yaşamalıdır" (5, 360).

Doğrudan da, dilin ümumiliyi fikirlərin, siyasi təfəkkürün, həmin dildə yaşadılmış mədəni sərvətlərin də ümumiliyinə, bədii-estetik düşüncənin də birliyinə gətirib çıxarır.

Xüsusilə millətlərin bir-birinə inteqrasiyasının gücləndiyi indiki dövrdə milli mənəviyyatımızın daha da zənginləşməsi və təbliği yolunda dünyada yaşayan azərbaycanlıların qüvvəsindən istifadə etməyin zəruriliyi məqsədilə 2001-ci il noyabrın 9-10-da Bakıda Dünya Azərbaycanlılarının I Qurultayının keçirilməsini təşkil olundu. 2002-ci ildə Xaricdə yaşayan Azərbaycanlılarla iş üzrə Dövlət komitəsi yaradıldı və bu qurum tək xaricdə yaşayan azərbaycanlıların bir-birilə əlaqəsini deyil, həm də xaricdəki Azərbaycan cəmiyyətlərinin, birliklərinin və dərnəklərinin fəaliyyətinin vahid mərkəzdən əlaqələndirilməsinə, həm də onların dövlət qayğısı ilə əhatə olunmasına geniş imkanlar yaratdı.

Millilik prinsipində maraq doğuran cəhətlərdən biri də milli mənəviyyatımızın zənginləşməsində ümumbəşəri dəyərlərə inteqrasiyanın əsas cəhət kimi götürülməsidir. Aydındır ki, öz milli və mənəvi kökünə sadiq olan hər bir gənc, həm də ümumbəşəri,

dünyəvi dəyərlərdən səmərəli istifadə etməyi, onları öz mənəvi dəyərlərimizə birləşdirərək xalqımızın mənəviyyatını daha da zənginləşdirməyi bacarmalıdır. Milli-mənəvi dəyərlərimizin dünyaya inteqrasiyası həm də ümumbəşəri dəyərlərə öz töhfəsini vermək kimi dəyərləndirilməlidir.

Azərbaycan milli idealogiyasının tərkib hissələrindən biri də dövlətçilik prinsipləridir. Gənc nəslin dövlətin Əsas Qanununa, onun bayrağına, gerbinə, himninə hörmət ruhunda tərbiyə edilməsini əsas vəzifə hesab edən ulu öndər bu sahədə təhsil müəssisələrinin üzərinə böyük məsuliyyət qoyurdu. Təhsili millətin gələcəyi hesab edən ulu öndər onun əsas məqsədini demokratik ruhlu, azad düşüncəli Azərbaycan vətəndaşları hazırlamaqda görürdü. Onun fikrincə, məktəblərdə Azərbaycanın müstəqilliyinin atributları yaxşı təbliğ olunmalıdır. Azərbaycanın dövlət müstəqilliyini təmsil edən Azərbaycanın bayrağına münasibət, onun müqəddəsliyinə hörmət hər bir uşaqda, yeniyetmədə daxilən olmalıdır. Azərbaycanın bayrağı sadəcə bayraq deyil, o, bizim dövlətçiliyimizin, müstəqilliyimizin rəmzi kimi verilməli və hörmətini tutmalıdır. "Azərbaycan Respublikası dövlət atributları işinin gücləndirilməsi haqqında" 13 mart 1998-ci il tarixli sərəncamı ilə Dövlət bayrağının, Dövlət gerbinin, Dövlət himninin ölkə vətəndaşlarına, o cümlədən məktəblilərə öyrədilməsi bu sahədə mühüm rol oynamışdır. Məhz bu sərəncamdan sonra "Azərbaycan Respublikasının dövlət rəmzləri" adlı ilk əsər nəşr olunur. Kitabda ilk dəfə müstəqil Azərbaycanın dövlət rəmzlərinin yaradılması tarixi sistemli işlənilir, milli rəmzlərin bərpası və qəbulu öz yerini tutur. Bundan sonra dövlət atributlarının mənası elmi şəkildə araşdırılır.

Xalqın öz milli-mənəvi, dini dəyərlərinə hörmət ruhunda tərbiyəsi onun mənəvi aləminin inkişafında mühüm məna kəsb edir. Əsrlər boyu Azərbaycan xalqı öz inam və inanclarına sadiq olmuşdur. Hələ sovet dövründə belə xalqımız öz dini inamlarından uzaqlaşmamış, əksinə, ondan mənbə kimi istifadə edərək mənəvi dəyərlərini zənginləşdirmişdir. Azərbaycan xalqının müstəqillik əldə etməsi həm də onun mənəvi, milli, və mədəni ənənələrinin bərpasına şərait yaratmışdır.

Hazırda Azərbaycan bir çox sahələrdə olduğu kimi təhsil sahəsində də nailiyyətlər qazanır. Bu proses həm də Azərbaycan mənəviyyatını zənginləşdirməklə yanaşı, milli-mənəvi dəyərlərimizə daha çox bağlı olmağı tələb edir. Təhsilin məzmununun müstəqil Azərbaycanın dövlətçiliyi prinsipləri əsasında qurulması ideyasının ön plana çəkilməsi də başlıca problemdir. Xalqımızın mənəviyyatının zənginləşdirilməsinin bir yolu kimi ümumbəşəri və dünyəvi dəyərlərdən səmərəli istifadə etməklə, onların öz mənəvi dəyərlərimizə sintez edilməsi də bununla bağlıdır. Ona görə də təhsilin məzmunca milli idealogiyaya uyğun, müstəqillik prinsiplərinə müvafiq qurulması dönə-dönə nəzərə çatdırılmışdır. Təhsilin məzmununun müstəqil Azərbaycanın dövlətçilik prinsipləri əsasında qurulması ideyası ön plana çəkildi: "Dövlət müstəqilliyinin xalqımıza bəxş etdiyi nemətlərdən biri də odur ki, biz artıq təhsil sistemimizi xalqımızın tarixinə, mənəviyyatına, ənənələrinə uyğun qururuq... Doğrudur, bu proses çox mürəkkəb prosesdir. Bu proses qısa müddətdə başa çata bilməyəcəkdir. Bu gün təhsil sahəsində çalışan bütün vətəndaşlara, müəllimlərə, təhsil müəssisələrinin rəhbərlərinə müraciət edərək xahiş edirəm ki, onlar tezliklə təhsil sistemində işlərin müstəqil Azərbaycanın prinsipləri əsasında qurulmasına nail olsunlar" (1). Bu vəziyyətdən çıxış yollarından biri kimi dərsliklərin dəyişilməsi, yeni dərsliklərin yaranması, təhsilin məzmunca milli müstəqilliyimizin prinsiplərinə uyğunlaş-

dırılmasında humanitar fənlər, xüsusən, tarix, dil və ədəbiyyatın tədrisinin, ilk növbədə məzmunca yeniləşdirilməsində görünürdü. "Milli idealogiyamızı hər yerdə tətbiq etmək üçün məktəblərdə Azərbaycan xalqının tarixinin tədrisinə çox ciddi fikir vermək lazımdır... Gənclərimiz öz tarixini, öz tarixi keçmişini gərək yaxşı bilsinlər. Çünki mənəviyyatımız, gənclərin bugünkü və gələcək mənəviyyatı bununla bağlıdır" (6).

Təhsilin milli zəmində inkişaf etməsini, milli kadr potensialımızın günü-gündən artmasını tövsiyə edən ulu öndər məhz müstəqil dövlətimizin idarəolunmasını və inkişafını yüksək savada, biliyə, ixtisasa, yüksək elmə malik insanların olmasında, özü də onların cəmiyyətdə çoxluq təşkil etməsində görürdü.

Gənclərin milli ruhda tərbiyə olunması, ulu babalarımızdan bizə miras qalmış zəngin mənəvi irsimizi öyrənmək, onun elmi mahiyyətini açmaq müasir dövrdə xüsusi əhəmiyyət kəsb edir. Bu mənada milli-mənəvi dəyərlərimizin, tarixi köklərimizin araşdırılması və təbliğinə Heydər Əliyevin irəli sürdüyü konseptual baxışlar əsas ideya istiqaməti və bu irsə dərindən bələd olmaq imkanı yaratmışdır.

*Rəyçi: prof. Ə.Ağayev*

**İstifadə edilmiş ədəbiyyat**


1. Əliyev H. Müstəqilliyimiz əbədidir. (çıxışlar, nitqlər, bəyanatlar, müsahibələr, məktublar, müraciətlər, fərmanlar). Bakı: Azərnəşr, 1998.
2. Ağayev Ə. Seçilmiş Pedaqoji Əsərləri. Bakı: Mütərcim. 2011.
3. Azərbaycan müəllimi qəzeti. 1997, 4 sentyabr.
4. Qəndilov S., Cəfərov N., Əhmədov H. H.Əliyev Azərbaycan məktəblilərinin gözü ilə. Bakı: Gənclik, 1998.
5. Təhsil millətin gələcəyidir. Bakı: Təhsil. 2012.


**П.Гасанова**

**Место принципа национализма в образовании**

**Резюме**


Наследие видногй личности, вождя мирового значения Гейдара Алиева имеет глубокую научную сущность и обладает многоаспектными особенностями.

В статье исследуется один из наследия Общенационального лидера-принципа национализма и указываются пути использования традиции в воспитании подрастающего поколения в национальном духе.

В статье оценивание принципа национализма отмечается не только на уровне национально-духовных ценностей, но и в глобальном значении, на уровне общечеловеческих ценностей.


**P.Hasanova**

**Place of nationality in heritage as one of the main principles of education**

**Summary**


The legacy of a prominent personality, a leader of global importance Heydar Aliyev has profound scientific nature and has many features of an aspect.

This article examines one of the heritage of national leader, the principle of nationalism and outlines ways to use tradition in educating the younger generation in the national spirit.

The article notes the assessment of the principle of nationalism, not only at the level of national and spiritual values but also in the global sense, at the level of human values.

***Psixologiya***

# SOSİAL ADAPTASİYA VƏ PEŞƏYƏ ADAPTASİYA

**Məhəbbət Vəliyeva**
***Akademik Zərifə Əliyeva adına liseyin direktoru***

**"Bizim müstəqil respublikamızda, Azərbaycan cəmiyyətində müəllim bu gün də, gələcəkdə də ən hörmətli insan kimi qəbul edilməlidir və müəllimlik peşəsi ən yüksək qiymətə layiq olan peşədir".**
**Heydər Əliyev**

***Açar sözlər:*** *adaptasiya, fərdilik, sosial vərdişlər, nəzəriyyə, zahiri amillər, emosional zəka, həmrəylik hissi.*

***Ключевые слова:*** *адаптация, индивидуальность, социальные привычки, теория, внешние составляющие, эмоциональное знание, чувство солидарности.*

***Key words:*** *adaptation, individuality, social habits, theory, external factors, emotional intellect, solidarity.*

Pedaqogika, psixologiya elmləri meydana gəldiyi ilk mərhələlərdə sosial istiqamət dominat olmuşdur. Sosial pedaqogika, sosial psixologiya XX əsrin əvvəllərindən fəal istifadə edilməyə başlanmışdır. Sosiallaşmanın əsasını sosial adaptasiya və insan muxtariyyətləşməsinin konkret cəmiyyət istiqamətində birləşdirilməsi təşkil edir. Sosial adaptasiya subyekt və sosial mühitin qarşı-qarşıya yönəlmiş fəallığın gedişi və nəticəsidir (J.Piaje, R.Mertan). Sosial adaptasiya şəxsiyyət və sosial mühitin eyni istiqamətinə yönəlmiş, bir-birini tamamlayan subyektin sosial davranışını cəmiyyətin məqsədlərinə uyğun inkişaf etdirə bilən prosesdir.

Cəmiyyət milyonlarla fəaliyyət və davranış modellərinin ahəngdar məcmusundan ibarətdir. Cəmiyyətə adaptasiya oluna bilmək həmişə problem olmuşdur. Bu sahədə müxtəlif nəzəriyyələr də meydana çıxmışdır.

Hələ XIX əsrin əvvəllərindən etibarən adaptasiya nəzəriyyələrində təkamül (uyğunlaşma) mühüm yer tutmuşdur. Lamarkın fikrincə, hər bir canlı varlıq özünü ətraf mühitə uyğunlaşdırır. İnsanlar da bu adaptasiyadan kənarda qalmır, əksinə, çox fəallıqla sosial adaptasiyaya qoşulur və öz peşəsinin əsl sahibinə çevrilirlər. Gərək insanda adaptasiya xüsusiyyəti olsun. Bütün varlıqlarda, canlılarda bu xüsusiyyət var. Hər hansı bir sistemdə bir dənə pozulma oldusa, adaptasiya getmir.

Psixologiya elmində ənənəvi olaraq, insanların adaptasiyasını onu əhatə edən mühitlə birgə nəzərdə tuturlar və normal insanların şəxsiyyət keyfiyyətlərini dəyərləndirirlər ki, onu əhatə edən dünya ilə adaptasiya yaratmağa yardımçı olsunlar. Yəni insan

başqaları ilə sülh və əmin-amanlıqla yaşasın, cəmiyyətdə özünə müvafiq yer tuta bilsin.

Rogers və Mastlou kimi psixoloqlar daha çox fərdilik, yaradıcılıq qabiliyyətlərinin stimullaşdırılması kimi müsbət xüsusiyyətlərə üstünlük verirlər. "Adaptasiya olunmaq" leksik məna baxımından uyğunlaşmaq, bağlı olmaq, müvafiq olmaq, uşaqları sevmək kimi anlamları özündə ehtiva edir.

Müasir sosial psixoloq Groviç sosial adaptasiya haqda belə yazır: "Hər şeydən öncə bilməliyik ki, insan və cəmiyyət biri-birindən ayrı mövcud deyillər və ola da bilməzlər. Bunların hər ikisi bölünməz vəhdətdə olaraq bir-birinin daxilində həll olmuşlar. İnsan cəmiyyətdə (ailədə), cəmiyyət isə insanda davam etdirilir və bu davamlılıq nəticəsində elə bir ikitərəflilik yaranır ki, burada cəmiyyət "mənin" daxilində "mən"-i "biz"-dən geri almaq mümkün olmur. Hər bir insan öz həyatında müxtəlif tələbatlar, motivlər müqabilində cəmiyyətin qanuni, ənənəvi, mənəvi məhdudiyyətləri ilə qarşılaşır. Bu məhdudiyyətlər (tabular) gizli və aşkar şəkildə ictimai prinsiplərə istinad edir, bəzi tələbatları təsnifatlandırır, bəzilərini məhdudlaşdırır, onları vərdişlərə çevirir. Bu çərçivədə insanın əməl və səyləri müəyyənləşir. Bu baxımdan insan məqsədlərə, arzulara yiyələnmək üçün başqaları ilə ictimai davranış və düzgün münasibətlər sistemi qurmalı, özünü cəmiyyətə adaptasiya etməlidir, yəni sosiallaşmalıdır.

Sosial adaptasiya səmərəli şəkildə həyat təcrübələri ilə uyğunlaşma qabiliyyətindən ibarətdir. Xüsusilə insanlararası münasibətlərdən zövq almaq və məqsədlərə uyğunlaşmadan istifadə etmək qabiliyyətindən ibarətdir. Sosial adaptasiya ictimai idrak kriteriyalarından biridir. Psixologiyada adaptasiya bu və ya digər dərəcədə şüurlu prosesdir, bu proses əsasında ictimai, təbii, yaxud mədəni mühitə uyğunlaşma baş verir. Bu uyğunlaşma onunla şərtlənir ki, insanların davranışında, münasibətlərində dəyişikliklər yaranır və həmin mühitə uyğun olan əlaqələrin yaranmasına nail olunur.

Sosial adaptasiya sosial inkişafın ölçülmə meyarıdır. Başqa sözlə, hər bir insanın sosial inkişafının ölçülməsi meyarı onun digər insanlarla adaptasiya səviyyəsidir. Bu, hamıya aiddir: dostlar, müəllimlər, ailə üzvlərindən tutmuş qonşulara və hətta ilk dəfə qarşılaşan şəxslərədək insanda vərdiş, uyğunlaşma və razılaşma qabiliyyəti həyati və anadangəlmə bir xislətdir. Fizioloji tənzimləmə sistemi bədənin bütün hissələrinə kömək edir ki, bu da insanın dərk olunan həyatının davamı olduğu üçün fəaliyyət göstərir və onun adaptasiyalı olmasına zəmin yaradır. Bu zəmin sisteminə ailə üzvləri arasında adaptasiya, həmyaşıdları ilə adaptasiya, əks cinslərlə adaptasiya, nəhayət, peşə, ixtisas (müəllimliyə) adaptasiyası daxildir.

Hər bir gənc öz həyat yolunu seçərkən ön plana çəkilən bir neçə psixoloji meyarlara istinad edir. Bunlardan əsası psixoloji qabiliyyətlərlə yanaşı, sosial adaptasiyanın olmasıdır. Çünki orta məktəb şagirdi sonradan pedaqoji universitetə daxil olur, oranı bitirib diplom alır, lakin o, bu peşə, ixtisas barədə çox cüzi təssəvvürə malik olur. Tədricən o, bu peşəyə adaptasiya olmalıdır, yəni uyğunlaşmalıdır.

Aydındır ki, böyük idealarla yaşayanların qarşısında böyük problemlər də durur. Ona görə də belə uşaqlar bəzən stress keçirirlər. Aydındır ki, güclü emosional təlatümdür. Bunun arxasında arzuolunmaz gerçəkliklər durur. Bunlardan qaçmaq üçün yeniyetmələrin peşə seçmə dövründə onlara təzyiq edilməməlidir. Onun həm arzusu, həm də imkanları əsas meyar kimi götürülməlidir. Daha dəqiq desək, adaptasiya prosesində psixoloji durumun rolu diqqətdən qaçırılmamalıdır. Müəllimlik peşəsi çox mürəkkəb bir peşədir, çünki o, uşaqlarla işləyir, onların bütün psixoloji stresslərini öz üzərində daşı-

yır, onların hərtərəfli inkişafının əsasını, təməlini qoyur. Bunları həyata keçirmək üçün bu peşəyə adaptasiya olunmalıdır.

Müəllimin hər bir davranışı sevgiylə, hikmətlə dolu olmalıdır ki, şagirdlərin xatirələrində müsbət emosiya kimi qalsın. Müəllim şəxsi məsələləri məktəbə daşımamalı, ədalətsiz davranmamalı, hər bir şəkildə obyektiv olmalı, bir sözlə, uşaqların potensialına xələl gətirən hərəkətlərə yol verməməlidir.

Gresman və Eliot sosial vərdişlərin qazanılmasında adaptasiyasının və adaptasiyalı davranışların rolunu yüksək qiymətləndirmişlər. Onlar sosial vərdişləri 5 qismə, növə bölmüşlər. Buraya: münasib danışıq qabiliyyəti vərdişləri, məsuliyyətlilik, böyüklərə hörmət və ehtiram, həmrəylik, əks cinsə qarşı sevgi, dözümlülük, əməkdaşlıq, yardımçı olmaq, humanistlik və s. daxildir.

Eriksonun nəzəriyyəsində elə sistemli mərhələlər vardır ki, insan onlardan keçmək və ətrafındakılarla qarşılıqlı münasibət yaratmaqla özünün şəxsiyyət faktorunu möhkəmləndirir və inkişaf etdirir. Erikson bir tərəfdən insanın özündə olan hislərə müraciət edən, digər tərəfdən şəxsiyyətlə başqalarının ondan istifadə etdiyi xüsusiyyətlər arasındakı əlaqələr üzərində kimlik anlayışına işarə edərək ona əsaslanır. "Mən" ilə cəmiyyət arasında qurulan münasibətlər iki əsas ənənəyə malikdir: bunlardan biri insanı ictimai qanunlara, digəri isə onu insan müqabilində müəyyən etməkdən ibarətdir.

Psixoloji araşdırmalarımız prosesində biz belə bir suala cavab axtarmaq məcburiyyətində qaldıq: adaptasiyalı insanlarda hansı xüsusiyyətlər və keyfiyyətlər olmalıdır? İlk növbədə: öhdəsinə götürdüyü işin vaxtında və keyfiyyətli yerinə yetirilməsinə nail olmaq imkanları, kədər, qəm-qüssə və ziddiyyətli olmaqdan uzaqlaşdırmaq imkanı, belə insanlar problemlərlə üzləşəndə, onları lazımi səviyyədə həll etmək qabiliyyəti vacibdir. Həmçinin o, ailə qurmağa meyilli, övladlarını düzgün tərbiyə etməyə can atmalı, başqalarının keçirdikləri hiss-həyəcanı dərk edərək onun həllinə yardımçı olmağa çalışmalıdır. Aydındır ki, fiziki qüsurlar onun həyat fəaliyyətini zəiflətmir, əksinə daha da dolğun həyat sürmək arzusu yaradır, öz daxili və maddi imkanlarını nəzərə alaraq, ətrafındakı adamlara yardımçı olmağa səy edir, həm də zahiri amillərin insanın ehtiyaclarına uyğun şəkildə dəyişdirilməsi mümkün olmayanlardan yan keçməyi bacarmalıdır. Adaptasiyalı insan öz emosiya və istəklərini qəbul etdirmək qabiliyyətinə malik olmalı, öz əhvali-ruhiyyəsini həmişə pozitivə istiqamətləndirməsinə nail olmalıdır. Bunlardan əlavə ictimai fəaliyyət və məsuliyyətlərdə iştirak etməyi bacarmalıdır. Əksər halda insanların uğursuzluqları yalnız xarici amillərdən qaynaqlanmır, onları düzgün qiymətləndirə bilməməyimizdən yaranır. Bu baxımdan həssaslıq və humanistlik sosial adaptasiyanın əsasını təşkil etdiyinə görə, adaptasiyalı insanlar özünün real əməlini, fikir və davranışını inkişaf etdirən insanlar kimi formalaşır. "Mənim yerimə özünüz olun" şüarından istifadə edir, özünün mənini real qəbul edir və çox vaxt özününəzarətə daha çox meyilli olur. Adaptasiyalı müəllimin bütün fənlərdən bilik və bacarıq qabiliyyəti vardır, o, depressiyanı, stressi və münaqişəni qəbul edib, öz imkanı daxilində onlarla mübarizə apara bilir, uğursuzluğa, maddi ehtiyaca qarşı dözümlülük göstərir. Beləliklə, adaptasiyalı insanlar öz hislərini qavramaq, düzgün qiymətləndirmək imkanına malikdir. Belə insanlar konfliktlərə və uğursuzluğa qarşı aparılan metodları dərk edər və onlardan həyat tərzində istifadə etməyi bacarar.

Tanınmış amerikalı psixoloq Maslou adaptasiyalı olmağın insanlara hansı müsbət təsir göstərməsini belə şərh etmişdir:

- Adaptasiya ona görə lazımdır ki,

başqaları sizdən narazı və incik olmasın;

- Maddi və mənəvi mənafe naminə təhlükəyə düçar olmamaq üçün adaptasiyalı olmaq vacibdir;
- Cəmiyyətdəki psixoloji durumun təhlili və münaqişələrin olmaması üçün;
- Cəmiyyətin, kollektivin qəbul etdiyi adaptasiya yerində sayan, hərəkətsiz və fəaliyyətsiz olmaq deməkdir;

Bunların olmaması, söz yox ki, adaptasiyalı olmaqla bağlıdır.

Emosional zəka, məntiqi təffəkkür ümümi zəkanın bir hissəsidir. Onun əsas əlaqəsi ictimai adaptasiya ilədir. Belə ki, XX əsrin əvvəllərində idraki zəkanın bir hissəsi olan emosional zəka bir neçə kriteriyanı özündə birləşdirir. Buraya daxili psixoloji qabiliyyətlər, şəxslərarası bacarıqlar və düşüncə sahibi olmaq da aiddir. Nəzərə alınmalıdır ki, düşüncə qabiliyyətindən məhrum olan insan var, dövlətindən, ümumiyyətlə, həyatdan zövq ala bilmədiyi kimi, cəmiyyət də düşünən beyni olan insanları olmadan mənasız və məqsədsiz həyat tərzinə məruz qalar. Çünki insan əlində olan sərvətin dəyərini də, ona olunan tövsiyələrin dəyərini də ağlı ilə dərk edər. Xeyir və şəri, elm və cəhalatı, nadanlığı və düşüncəni də müqayisə edə bilər. Zaman və məkandan asılı olaraq insanların bu məsələlərə olan baxışı biri-birindən fərqli, hətta təzadlı ola bilər. Ona görə də elə məktəb illərindən uşaqların hansı tərəfə istiqamətləndirilməsinə, hansı vərdişlərə adaptasiya olunmasına diqqət yetirilməlidir. Qarşıdakı hər uşağa yetginləşmiş vətəndaş kimi yanaşılmalıdır. Uşaqlarda elə xarakter formalaşdırılmalıdır ki, o, öz seçimində azad və ixtiyar sahibi olsun. Bunun üçün də müəyyən elmi və həyati biliklərlə silahlanmalıdır. Pedaqoji kollektivin bütün üzvləri bu cəhətləri hər an nəzərdə saxlamalıdırlar.

Gardnerin fikrinə görə, müəllim özünün daxili zəkası ilə fikirləri, hiss-həyəcanları, əlaqələri mənalandırır, formalaşdırır və onlardan faydalanmağa imkan yaradır.

Mayer və Salovey (1999) emosional zəkanı insanın özünün və başqalarının nəzarət imkanlarını, bacarıq və qabiliyyətlərini, şagirdlər arasındakı fərqli cəhətləri yaradan kriteriyalarda olduğunu qeyd edərək onları beş hissəyə bölmüşlər:

- Özünüdərk; bu hal insanların özünüdərk etmə, özünənəzarəti və özünütəsdiq etmək imkanlarını yaradır və formalaşdırır,
- Emosiyaların idarə olunması; emosiyalara nəzarət belə hislərin yaranması səbəbləri, onları təyin etmə metodları, qorxu (fobiya), əsəbilik, stresslər və buna bənzər hislərin idarə olunması və bunlara nəzarət olunma mexanizmlərinin tapılması,
- Özünütəşviq; Belə hislər və emosiyaların məqsədyönlü istiqamətləndirilməsi, özünəməxsus emosiya, istək və arzuların həyata keçirilməsini əhatə edir,
- Həmrəylik hissi; başqalarının hiss və münasibətlərinə, onların baxışlarına dözüm, müəyyən bir işlə bağlı öz hisləri ilə əlaqədar insanlar arasında mövcud fərqləri qiymətləndirməkdən ibarətdir.
- Əlaqələrin tənzimlənməsi; digər insanların emosiyalarını idarə etmək və ictimai vərdişlərdən faydalanmaqdır.

Bu göstərilənlərlə yanaşı, əsas diqqəti çəkən cəhət tanınmış psixoloq Daniel Golmanın apardığı tədqiqatlar və əldə etdiyi nəticələrdir.

Emosional zəka mütəxəssislərinin idrak prosesinə aid son tədqiqatlarında (Bar On, Karl Dufolko və b.) məntiq və emosiya arasında fərq olduğu vurğulanır. Əksinə, ilk tədqiqatlarda düşüncə və emosiya adaptasiya və idrak üçün aktual mövzu kimi nəzərdə tutulmuşdur. Mayer inanır ki, emosional zəka (Eİ) emosional informasiyaları mənalandırmaq və təcrübədə tətbiq etmək üçün psixoloji bir qabiliyyətdir. Bununla əlaqədar insanlar müxtəlif qabiliyyətlərə malikdirlər,

bu, bəzən orta, bəzən də yüksək səviyyədə ola bilər. Bunlarla yanaşı, ictimai qabiliyyət başqalarını dərk etmək, əlaqələri toplayaraq idarə etmək bacarıqlarını özündə birləşdirir.

Bildiyimiz kimi, ictimai qabiliyyətlər emosional zəka vərdişlərinin məhsuludur. Bu vərdişlər, əsasən, müəllim peşəsində başqalarının (şagirdlərin) iştirakı ilə əldə olunur. Buraya ictimai şüuru və əlaqələrin idarə olunmasını aid etmək olar. İctimai qabiliyyətlər şüurla başqalarının emosiya və hisslərini dəqiq araşdırmaq və onların hansı hissləri keçirdiyini başa düşmək bacarığından ibarətdir.

"Sevimli" və "cazibədar" ifadələrlə müəllim şagirdlərlə möhkəm əlaqə yaradır və onların daha da sağlam düşüncə tərzinə təkan verir.

Salovey, Hess və Mayerin fikrincə, emosional zəka üç müəyyən çərçivəyə malikdir. Bunları aşağıdakı kimi vermək olar:

- Emosional hissin dəqiq ifadə olunması,
- Başqaları ilə adaptasiya olunmaq üçün emosiyaların tənzimlənməsi,
- İşlərin layihələndirilməsi, yaradılması və təşviqi üçün emosiyalardan istifadə edilməsi.

Yuxarıda deyilənlər belə bir ümumiləşdirmə aparmağa imkan verir:

- Müəllimlik çox mürəkkəb və xüsusi qabiliyyət tələb edən bir peşədir.
- Sosial adaptasiya ilə emosional zəka arasında bir əlaqə mövcuddur.
- Adaptasiyalı insanlarda (müəllimlərdə) 20-dən çox keyfiyyət xüsusiyyətlərinin olmasına da Maslounun tədqiqatlarında rast gəlinir.

*Rəyçi: psixologiya elmləri doktoru İ.Novruzlu*

**İstifadə edilmiş ədəbiyyat**

1. Bayramov Ə. Əlizadə Ə. Psixologiya. Bakı, 2002.
2. Əlizadə Ə. İdrak prosesləri və hislər. Psixopedaqoji məsələlər. Bakı, 2006.
3. Əliyev B. Cabbarov R. Təhsildə şəxsiyyət problemi. Bakı, 2008.
4. Qədirov Ə. Xəlilov N. Yaş psixologiyası. Bakı, 1999.
5. Мухина В. Возрастная психология: феноменология развития, детство, отрочество. М., 2004.

**М.Велиева**

**Новый подход к социальной адаптации учителя**

**Резюме**

В данной статье особое внимание направлено на роль учителя в школе и обществе. Способность к социальной адаптации с эмоциональным знанием является определяющим фактором кождого учителя.

**M.Valiyeva**

**Social adaptation and adaptation to profession**

**Summary**

In this article special attention is given to the role of teachers at school and in the society. Ability for social adaptation along with knowledge is the determining factor of every teacher.

# TƏHSİLDƏ ÇƏTİNLİKLƏRİN ARADAN QALDIRILMASINDA FƏRDİ YANAŞMA BARƏDƏ

**Sevil Abdinova**
***S.C.Pişəvari adına humanitar fənlər gimnaziyasının müəllimi***

***Açar sözlər:*** *ibtidai təhsil, inkişaf səviyyəsi, diaqnostik müayinə, intellektual inkişaf, kollektiv, dünyagörüş, fəallaşma.*

***Ключевые слова:*** *начальное образование, уровень развития, диагностические обследования, интеллектуальное развитие, коллектив, мировоззрение, активизация.*

***Key word:*** *primary education, development level, diagnostic check up, intellectual development, collective, world outlook, interactive.*

İbtidai təhsil uşaqların ümumi orta təhsilinin başlanğıc mərhələsi olmaqla, əsas məqsədi onlara (bu pillədə təhsil alanlara) ətraf aləm haqqında ilkin bilikləri vermək, onları bir şəxsiyyət kimi formalaşdırmaq və inkişaf etdirməkdir. Ümumi orta təhsilin bu mərhələsinin qarşısında məhz belə bir məqsədin qoyulması, onun cəmiyyət, dövlət, ölkə və xalq (millət) üçün nə dərəcədə vacib bir məsələ olduğunu göstərir. Məsələ burasındadır ki, təhsilin digər (ümumi orta və ya peşə-ixtisas) pillələri ilə müqayisədə ibtidai təhsilin problemləri və uyğun olaraq ibtidai, xüsusilə birinci sinif müəllimlərinin qarşısında duran çətinliklə yalnız hələ yazmağı, oxumağı, saymağı, əşya və hadisələri öz adı ilə düzgün adlandırmağı bacarmayan kiçikyaşlı uşaqlara onların həyatlarının sonunadək istifadə edəcəkləri vərdiş və qabiliyyətləri öyrətməklə, yiyələndirməklə bağlı olan problem və çətinliklərlə bitmir.

Burada, (ümumi orta təhsilin bu pilləsində) xüsusilə də birinci sinifdə, ibtidai sinif müəlliminin rastlaşdığı ən başlıca və düzgün həll olunması çox yüksək həssaslıq və xüsusi diqqət tələb edən problemlərdən biri, eyni bir sinfə toplaşan müxtəlif inkişaf səviyyəli ("güclü" və "zəif" inkişaf etmiş), müxtəlif ictimai mühitlərdən (məktəbəqədər təhsil müəssisələrindən və fərdi ailə mühitindən) gəlmiş, ayrı-ayrı mühitlərdə (ziyalılığı, sosial təminatı, dünyagörüşü, uşağa diqqəti, tərbiyələndirmə üsulu və seçimi ilə fərqlənən ailələrdə) böyümüş və indi onun (həmin sinifdə dərs aparan müəllimin) sinfində bir yerə cəmlənmiş uşaqlarla uğurlu təhsil işinin həyata keçirilməsinə düzgün yanaşma, onlarla düzgün ünsiyyətə gələ bilmə məsələsinin həllidir. Bu məsələ sadəcə olaraq hamının (sinifdəki şagirdlərin) eyni dərs otağında və eyni cür, eyni rəngli, eyni biçimli məktəbli stolunda oturdulması, hamı üçün eyni (vahid) olan məktəbli forması geyinməsi, pulsuz dərsliklər, eyni cür dərs vəsaitlərindən istifadə etməsi ilə həll olunmur. Bütün bu sadalanan təminatlar məsələnin zahiri və bəlkə də ikincidərəcəli tərəfləridir.

Məsələnin mürəkkəbliyi, onun çoxarqumentli olması ilə yanaşı, həm də düzgün həlli yollarının da müxtəlif olmasıdır. Ancaq əksər hallarda olduğu kimi, burada da kiçik fərdiliklərlə yanaşı, ümumi pedaqoji və psixoloji prinsiplərə, mövcud dövlət standartlarına arxalanan (söykənən) düzgün yanaş-

ma metodu seçmək olar və bu, çox vacibdir. Sözsüz ki, məsələyə, onun uğurlu həllinə dair vahid bir resept vermək (təklif irəli sürmək) heç də düzgün olmaz. Onun barəsində (ətrafında) təcrübələrə əsaslanan çoxlu müzakirələr aparıb, ayrı-ayrı konkret hallara uyğun təkliflər vermək daha düzgün olardı.

Öz 15 illik ibtidai sinif müəllimlik təcrübəmdə bu istiqamətdə sınaqdan keçirdiyim və müsbət effektini gördüyüm (müəyyənləşdirdiyim) bəzi məqamların üzərində dayanmağı məqsədəuyğun sayıram.

Hələ uşaqlar birinci sinifdə dərsə başlamadığı, yəni dərs ilinin başlanğıcına qədərki dövrdə onlarla kontaktda olduqda, ən başlıcası isə birinci sinifdə tədris prosesinin başlandığı ilk (birinci) həftə ərzində sinifdəki uşaqlar üzərində apardığım intensiv nəzarət-müşahidə işləri nəticəsində özüm üçün (qeyri-rəsmi olaraq) onları bir neçə qrupda qruplaşdırıram. Daha doğrusu, hər bir uşağın tədris, tərbiyə və təlim prosesi ilə bağlı, özünü qabarıq şəkildə büruzə verən çətinliklərini (problemlərini) əsasən təsvir edə bilən xüsusi, necə deyərlər, “məxfi” və ya “anonim” anket tərtib edirəm. Bu anketdə hər bir uşaq üçün apardığım diaqnostik müayinələr (müşahidələr) əsasında onun başlıca fərdi xüsusiyyətlərini və tədrislə bağlı çətinliyinin nədə (hansı aspektdə) daha çox (daha qabarıq) özünü büruzə verdiyini göstərirəm. Məsələn, belə qeydlər edirəm: “tez-tez fikri yayınır”, “fikrini toplaya bilmir”, “ümumi yanaşma ilə verilən bilikləri qəbul edə (qavraya) bilmir”, “müntəzəm olaraq tapşırıqların öhdəsindən gələ bilmir”; “əlavə göstərişlərə çox ehtiyacı var”, “yaddaşı zəifdir”, “həddən artıq utancaqdır”, “həddən artıq ərköyündür”, “çox təkəbbürlüdür”, “fiziki imkanları zəifdir – tez yorulur”, “dərs zamanı sıxıntı keçirir”, “kollektivə öyrəşməyib”, “müstəqil məşğul ola bilmir”, “ailədə məşğul olmaq imkanı yoxdur”, “ailədə məşğul olmaq imkanları çox genişdir”, “hansı dərslərdə (fənlərdə) daha çox çətinlik çəkir”, “hansı dərslər onun üçün çox asandır” və s. Sözsüz ki, hər bir şagird üçün tərtib etdiyim belə fərdi anketin sonunda qeyd etdiyim “hansı vasitələrdən istifadə etməklə onun bu çətinliklərini (qüsurlarını) aradan qaldırmaq olar” qrafasında bu barədə öz fikrimi yazıram.

Bütün bu diaqnostik müayinələrdə uşaqların intellektual inkişafı, iri və xırda mütəhərrikliyi, yaddaşı, müstəqilliyi, sərbəstliyi, iradə və özünü səfərbər edə bilmə imkanları öyrənilir.

Sonra tərtib etdiyim həmin məxfi anketlərdə göstərilənlərə uyğun olaraq özüm üçün dərs apardığım sinifdəki uşaqları (əlbəttə ki, onların özlərinə bildirmədən) qruplaşdırıram və tədris prosesində ümumi prinsiplərlə yanaşı, anketlərdə göstərilənlərə uyğun olaraq, hər bir qrupdakı şagirdlərə fərdi yanaşma üsullarından da istifadə edirəm. Əlbəttə, qruplaşdırma prosesində çox xırdalıqlara getmirəm. Bu da imkan verir ki, adətən sinifdə olan 30-a qədər şagirdi belə bölgü əsasında maksimum 3-5 qrupa bölüm.

Sonrakı müşahidələrim göstərir ki, həmin qruplara daxil etdiyim şagirdlər arasındakı fərq nəinki illər, rüblər, hətta aylar və həftələr ərzində belə tədricən və nəzərəçarpacaq dərəcədə azalır. Beləliklə, ikinci, üçüncü siniflərdə dərs apardığım sinifdə əlaçı, yaxşı oxuyan və nisbətən zəif oxuyan şagirdlərim olsa da, daha onların sırasında birinci sinfə qədəm qoyduqları ilk günlərdəki kimi yuxarıda sadaladığım aspektlərdə ciddi problemli şagirdlərim olmur. Davranış, münasibət, təşkil olunmaq və s. ilə bağlı bir çox fərqlər isə, demək olar ki, tamamilə aradan qalxır. Əksər hallarda isə, birinci sinfin ilk günlərində çox ciddi çətinlikləri olan şagirdlər ikinci və üçüncü siniflərdə artıq sinfimizin ən fəal, daha yaxşı oxuyan, müstəqil çalışa bilən, kollektivimiz tərəfindən daha çox sevilən şagirdinə çevrilir.

Birinci sinifdə dərslərin başlandığı ilk günlərdə dərs apardığım sinifdəki uşaqları qruplaşdırmaq məqsədi ilə keçirdiyim diaqnostik müayinələr nəticəsində müəyyənləşdirmişəm ki, bir qayda olaraq sinifdəki uşaqlardan sayca birinci yerdə (təqribən 55–60 %) lazımi məqamda özünü səfərbər edə bilməyən, zəifiradəli, yəni uzun müddət (dərs saatı ərzində) sakit otura bilməyən, diqqətsiz, idarə olunmayan, təşkil olunmaya yatmayan, sözəbaxmayan uşaqlar; ikinci yeri (təqribən 20-25 %) fəaliyyətində adekvat modifikasiya, yəni passivlik, istəksizlik, maraqsızlıq, ancaq özünün istədiyi kimi və istədiyi halda (məqamda) fəallıq göstərən uşaqlar; üçüncü yerdə (təqribən 10-15 %) tədris materialı üzərində işləmək qabiliyyəti aşağı (zəif) olan, yəni ya ümumiyyətlə, yorğun, ya da tez yorulan, işləmək qabiliyyəti kifayət qədər olmayan (zəif olan) uşaqlar olur. Yalnız az bir qisim (təqribən 5 %-ə qədər) uşaq isə yuxarıda sadaladığım digər qruplara daxil olan psixi təşkilatlanması və dərketmə qabiliyyəti anadangəlmə aşağı (zəif) olan, yəni uyğun olaraq fəaliyyət tempi ləng (asta) və fəaliyyət qabiliyyətinə malik olmayan uşaqlar olur.

Uşaqların tədrislə bağlı bu çətinliklərini aradan qaldırmaq (problemlərini həll etmək) üçün əsas vasitəni elə onların şagird (məktəbli) olduğu ilk gündən başlayaraq, məktəb psixoloqunun, loqopedin, hər bir şagirdin öz valideynlərinin köməyindən, evdə valideynlər və baba-nənə, böyük bacı-qardaşların vasitəsi ilə, eləcə də (ən başlıcası məktəbdə (özüm və köməkçi müəllim tərəfindən) əlavə məşğələlərin təşkil olunmasından geniş istifadə etməkdə görürəm. Bununla belə, ən başlıca təsir metodunu şəxsən özümün ümumi sinif fonunda hər bir şagirdə həm də fərdi yanaşmamda və təsirimdə görürəm. Belə ki, hər bir şagirdə onun haqqında tərtib etdiyim “məxfi” fərdi anketimdə daxil etdiyim “çətinliklər” qrupundan asılı olaraq xüsusi yanaşmalar edirəm. Bu yanaşmalar başlıca olaraq şagirdlərdə müşahidə etdiyim çətinlik probleminin aradan qaldırılmasına yönəldilir.

Birinci qrupa daxil etdiyim şagirdlərə müntəzəm olaraq əlavə tapşırıqlar verməklə, tez-tez suallarla onlara müraciət etməklə, onları diqqətimdə saxladığımı hiss etdirməklə yanaşıram.

İkinci qrupa daxil etdiyim şagirdlərə intellektual tapşırıqlar verir və günbəgün bu tapşırıqların miqdarını (həcmini), çətinlik dərəcəsini tədricən və müntəzəm olaraq artırıram.

Üçüncü qrupa aid etdiyim uşaqları mümkün qədər onların əqli və fiziki (sağlamlıq) gücləri çatan tapşırıqlara cəlb edirəm.

Adətən şagirdlər sırasında dördüncü qrupa aid etdiyim uşaqlara çox az hallarda təsadüf olunur. Bu uşaqları dərs zamanı, eləcə də dərsdən sonra həm özümün, həm də köməkçi müəllimin, məktəb psixoloqunun diqqətində saxlayır, sinifdəki uşaqların onlara yanaşması tərzinə ciddi diqqət yetirir, valideynləri ilə tez-tez əlaqə saxlayır, mütəmadi qaydada tapşırıqlar, göstərişlər və məsləhətlər verir, onların öz uşaqları barədə fikir və təkliflərini dinləyir və həmin şagirdlə fərdi iş fəaliyyətimdə bunları nəzərə alıram. Həm də təkcə bu fikir və təklifləri sadəcə dinləməklə, uşaqların davranışı barədə fikirlərini onlara söyləməklə kifayətlənmir, onlarla (valideynlərlə) birgə (sıx) əməkdaşlıq edir, uşaqların ev ünvanlarına təhkim olunmuş sahə uşaq həkimləri ilə (pediatorlarla) yaxud da onların hansısa bir xəstəliyini müalicə və ya müayinə edən həkimin uşaq haqqında dediklərindən xəbər tutur, bu məlumatları həmin uşaqla təmasımda, onunla bağlı pedaqoji fəaliyyətimdə hökmən nəzərə alıram.

Apardığım müşahidə və təhlillər göstərir ki, əksər hallarda “anonim” anketlərlə

ayrı-ayrı qruplara ayırdığım uşaqların bilik səviyyəsində nəzərəçarpan fərqlər mövcud olsa da (çünki sinifdə oxuyan 25-30 nəfər uşağın sifətinin rəngi, cizgiləri, boyu, çəkisi və s. kimi, sözsüz ki, bilik səviyyəsi də fərqli olacaq), onların təhsilinə ciddi təsir göstərən digər fərdi keyfiyyətləri (problemləri), yəni utancaqlıq, həddən artıq sərbəstlik, iradəsizlik, tənbəllik, təkəbbürlülük, ərköyünlük, küsəyənlik və s. ilə bağlı çatışmazlıqlar xeyli dərəcədə aradan qalxır, onlar kollektivləşirlər. Bu isə sözsüz ki, öz növbəsində onların tədris olunan materialı mənimsəmələrinə, düşünmək, sərbəst işləmək sahəsində fəallaşmalarına, dünyagörüşlərinin artmasına, bir şəxsiyyət kimi formalaşmasına güclü təsir göstərir. Dərs apardığım sinifdəki uşaqların arasında yaranan qarşılıqlı xoş ünsiyyəti həmin sinifdə təhsil və tərbiyənin uğurla həyata keçirilməsində özümün ehtiyat qüvvəmə çevirirəm.

Əlbəttə, pedaqoji fəaliyyətdə ümumi tələblər istisna olmaqla, heç də yüz minlərlə müəllimin hər birinin dedikləri fikirlər bir ehkam kimi qəbul və məcburi şəkildə tətbiq oluna bilməz. Lakin bu da, bir təcrübə mübadiləsi, iş prosesində sınaqdan keçirilməsi və yoxlanılması pis olmayan xoşməramlı bir təklifdir. Mənim təqdim olunan məqalədə irəli sürdüyüm fikirlərim və seçdiyim tədris prosesində problemli (çətinlikləri olan) ibtidai sinif şagirdlərinə yanaşma metoduna aid müəllim həmkarlarımın münasibətlərini, fikir, təklif və iradlarını bilmək də mənim üçün çox xoş olar.

*Rəyçi: dos. Ə.Abbasov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasının Təhsil Qanunu, B., 2009.
2. Azərbaycan Respublikasında ümumi orta təhsilin dövlət standartları. B., 2005.
3. Qasımova L., Mahmudova R. Pedaqogika. B., 2003.
4. Zeynalov A. Təlimdə geridə qalan şagirdlərə fərdi yanaşma. B., 1996.
5. İsmixanov M. Pedaqogikanın əsasları. B., 2009.
6. Kazımov N. Mərhələli tərbiyə nəzəriyyəsi. B., 2007.
7. Axundov S., Həsənov A. Ailədə uşaqların əxlaq tərbiyəsi. B., 1991.
8. Əlizadə Ə., Abbasov A. Ailə həyatının etika və psixologiyası. B., 1988.
9. Подласый И. Педагогика. М., 2000.

**С.Абдинова**

**Об индивидуальном подходе при предотвращении трудностей в образовании**

**Резюме**

В статье говорится о часто встречающейся проблеме, касающейся учащихся начальных классов. Комментируется значение метода, использованного педагогами начальных классов в предотвращении подобных трудностей на своей практике.

**S.Abdinova**

**About the individual approach on eliminating challenges**

**Summary**

The article is dedicated to the problems of primary class students. An experienced teacher’s consultations and essential methods are commented as a sample to eliminate these challenges.

# МЕТОДИКА РАБОТЫ НАД ЛЕКСИКОЙ В УСЛОВИЯХ ТРИЛИНГВИЗМА (АНГЛИЙСКИЙ ЯЗЫК)

**Марал Гандилова**
***ст. преподаватель кафедры иностранных языков Азербайджанского Технического Университета, заслуженный учитель Азербайджана***

***Açar sözlər:*** *metodika, üçdillilik, interferensiya, köçürmə, çətinliklər, spesifika.*
***Ключевые слова:*** *методика, трилингвизм, интерференция, перенос, проблемы, специфика.*
***Key words:*** *methods, trilingual, interference, transfer, challenges, specifics.*

В настоящее время большое значение приобрели вопросы методики преподавания иностранного языка в национальных вузах, т.е. в условиях трилингвизма, связанные с большим кругом проблем как чисто психологического, так, и лингвистического характера. Методика преподавания иностранного языка в национальном вузе имеет ряд специфических особенностей, связанных, в первую очередь, с взаимодействием разносистемных языков. Эта специфика методики преподавания иностранного языка определяется, прежде всего, большим лингвистическим опытом билингвов по сравнению с монолингвами. По этому, существует необходимость рассмотрения проблем влияния родного и первого неродного языков на иностранный (английский), как в чисто теоретическом плане, так и в плане практики, т.е. в динамике речевого общения.

С другой стороны, специфика методики преподавания иностранного языка в национальном вузе, определяясь и лингвистическими факторами, в частности, соотношением структур контактирующих языков, делает необходимым исследование взаимовлияния в статике, т.е. исследование возможностей взаимовлияния.

Перед студентами вуза ставится задача владения речью, приближенного к уровню речи носителя языка, что, естественно, предполагает овладение необходимой для этой цели наиболее коммуникативно-ценной общеупотребительной лексикой, без которой невозможно адекватное выражение студентами своих мыслей. Степень владения иностранным языком определяется - умением выражать свои мысли, в соответствии с языковыми нормами изучаемого иностранного языка. А также, умение употреблять в нужной ситуации именно ту лексическую единицу (ЛЕ), которая четко, точно и ясно, убедительно, экономично и стилистически правильно передает высказываемую мысль. Поэтому, одной из основных методических проблем вуза является обучение студентов употреблению лексики в речи при оформлении высказывания на ино-

странном языке.

В последние годы вышел ряд работ, связанных с обучением иностранным языкам, где отмечается важность методики работы над лексикой. Рассматриваются вопросы определения специфических особенностей и трудностей ЛЕ, их типологии, а также создание систем упражнений, соответствующих обогащению словаря для активного и пассивного владения /1, 2/.

Целью данной статьи является разработка методики обучения студентов - билингвов иностранному языку в национальных группах, с учетом специфических условий обучения. К специфическим условиям относятся то, что, студенты уже владеют, в определенной степени, как русским, так и английским языками, и, поэтому следует учитывать исходный уровень обучаемых, а с другой стороны, на усвоение лексики влияют навыки употребления ЛЕ на родном (азербайджанском) и первом неродном (русском) языках. Отсутствие других работ по систематическому изучению в сопоставительном плане, в частности, в методических целях, определяет одну из задач настоящего исследования, заключающегося в рассмотрении способов и средств выражения ЛЕ в трех разносистемных языках: азербайджанском, русском и английском - в сопоставительном плане.

Такой анализ языков позволяет выявить возможности положительного переноса знаний, умений и навыков; а также выявить причины ошибочного употребления значений слов студентами, что связано с определением зон внутри- и межъязыковой интерференций (интерференция - отрицательное влияние родного (азербайджанского ) и первого неродного (русского) языков на усвоение лексики). Однако, для того, чтобы выявить реальные трудности усвоения лексического материала студентами - билингвами необходимо проанализировать гносеологические, психолингвистические, лингвистические и методические причины, порождающие интерференцию. Конечно, целью обучения в нашем случае является усвоение студентами лексического материала. Однако продуктивное усвоение лексики не ограничивается семантизацией и запоминанием, а складывается из большого количества умений и предполагает известную степень их автоматизации для свободного использования ее в речевой деятельности. Поэтому, прежде всего мы попытаемся определить какие умения должен приобрести студент в процессе усвоения иноязычной лексики. При этом мы учитываем, что ЛЕ представляет собой единство формы, значения и особенностей употребления. Проблемы усвоения формы слова освещены в целом ряде работ и, поэтому, мы рассматриваем только проблему усвоения смысловой стороны слова и развития умений употребления его согласно нормам сочетаемости.

Усвоение смысловой стороны слова и правильное употребление его в речи предполагает:

1. умение узнавать слово в различных, непривычных сочетаниях с другими словами, образных контекстах:

gear -шестерня, зуб, колесо.

To get into gear- приняться за работу.

Close to home - задеть за живое.

To give and take-чередующийся (об условиях).

2. умение понимать отдельные оттенки слова в зависимости от контекста:

Hard - 1. усердно; 2. трудный; 3. твердый, прочный.

The students of this group work hard.

This work is hard shall I help you?

* 4

Azərbaycan Demokratik Respublikasının dövlət müstəqilliyi haqqında qəbul olunmuş aktdan sonra 1921, 1924-cü illərdə Azərbaycanda qəbul edilmiş konstitusiya barəsində maraqlı məlumat verirdi: "... bildiyiniz kimi, 1920-ci ildə Azərbaycanda Sovet Sosialist Respublikası yaranıbdır. Bu respublika 1921-ci ildə Azərbaycanın ilk konstitusiyasını qəbul edibdir. O vaxt hələ Sovetlər İttifaqı yox idi. Yaranmış və şübhəsiz ki, kommunist hakimiyyəti altında olan respublikalar müstəqil idilər. Bu konstitusiya müəyyən dəyişikliklərlə 1937-ci ilə qədər davam edibdir. Baxmayaraq ki, 1924-cü ildə, Sovetlər İttifaqı yaranandan sonra onun Konstitusiyası da yaranmışdı, amma Azərbaycanda 1921-ci ildə qəbul edilmiş konstitusiya davam edirdi. Ancaq şübhəsiz ki, ona dəyişikliklər, əlavələr olunmuşdu".

Heydər Əliyev sonrakı dövrlərdə Azərbaycan Sovet Sosialist Respublikasında qəbul olunmuş konstitusiyalar barədə anlaşıqlı məlumatı təkcə öz biliyinə çevirməmiş, onu geniş ictimaiyyətə çatdırmağı, o vaxtlar Azərbaycan Respublikası müstəqil dövlət olmadığı üçün konstitusiyalarda kommunist ideologiyasının, sovet hakimiyyətinin prinsiplərinin əks olunduğunu dönə-dönə xatırlamağı özünə borc bilmişdir. Onun 1937, 1938-ci illərdə qəbul olunmuş konstitusiyalar barədə dediklərində real Azərbaycan konstitusiyasının tarixi vərəqlənir: "1936-cı ildə Sovetlər İttifaqının yeni konstitusiyası qəbul edildikdən sonra – 1937-ci ildə Azərbaycan Sovet Sosialist Respublikasının yeni konstitusiyası qəbul olunub. Bu konstitusiya 1978-ci ilə qədər yaşayıbdır. 1977-ci ildə Sovetlər İttifaqının yeni konstitusiyası qəbul olunub və ondan bir il sonra, 1978-ci ilin aprelində Azərbaycan Respublikasının yeni konstitusiyası yaranıbdır".

Heydər Əliyev Azərbaycan Respublikasında 1978-ci ildə qəbul olunmuş konstitusiya barəsində və müstəqillik əldə etdikdən sonra 1991-ci ilin oktyabrın 18-də qəbul olunmuş konstitusiya aktı barəsində siyasi məqamlara xüsusilə diqqət yetirirdi. Əsasən 1991-ci il oktyabrın 18-də qəbul olunmuş konstitusiya aktına qədərki 1978-ci il konstitusiyası barədə deyirdi: "İndiyə qədər Azərbaycan Respublikası 1978-ci ildə qəbul olunmuş konstitusiya ilə yaşayır, işləyir. Doğrudur, bu müddətdə konstitusiyaya bir çox əlavələr, dəyişikliklər edilibdir. Xüsusən qeyd etmək lazımdır ki, Azərbaycan dövlət müstəqilliyini əldə edəndən sonra -1991-ci il oktyabrın 18-də Konstitusiya Aktı qəbul edilibdir". Bununla belə, Heydər Əliyev bu konstitusiya aktı ilə bağlı fikirlərini söyləyərkən bir sıra ciddi məsələlərə diqqəti yönəldir, bəlkə də bir çoxlarının çox adi yanaşdığı, bir çoxlarının isə siyasi mahiyyətinə varmadıqları məqamları xatırladırdı.

Belə ki, Azərbaycan Milli Məclisinin 1992-ci il dekabrın 22-də qəbul etdiyi "Azərbaycan Respublikasının dövlət dili haqqında" qanunu Azərbaycan Respublikasının qüvvədə olan konstitusiyasının (1978-ci il konstitusiyası) və "Azərbaycan Respublikasının Dövlət müstəqilliyi haqqında konstitusiya aktı"nın müddəaları ilə ziddiyyət təşkil edirdi. Ona görə də Azərbaycan Milli Məclisinin 1992-ci il dekabrın 22-də qəbul etdiyi "Azərbaycan Respublikasının dövlət dili haqqında" qanunu heç bir hüquqi qüvvəyə malik deyildi. Bu mənada Heydər Əliyev deyirdi: "Azərbaycan Respublikasının 1978-ci ildə qəbul olunmuş konstitusiyanın dövlət dili haqqında 73-cü maddəsi Milli Məclisin məlum qərarı ilə ləğv olunmur (Azərbaycan Milli Məclisinin 1992-ci il dekabrın 22-də qəbul etdiyi qərar nəzərdə tutulur – B.X.), o, qüvvədədir. Bax, respublikamızda belə qarışıqlıq yaranıbdır. O vaxt dövlət və hökumət başçıları, bu böyük məsuliyyəti üzərinə götürən adamlar belə qərarı, qanunu qəbul edərkən sizinlə məsləhətləşiblərmi? Onlar Elmlər Akademiyası,

Yazıçılar Birliyi ilə, bizim bu alimlərimizlə, dilçilərimizlə məsləhətləşiblərmi?".

Beləliklə, bu görkəmli siyasətçinin siyasi biliyi, hadisələri və tarixi məqamları təhlil etmək qabiliyyəti, keçmiş Sovetlər İttifaqında gedən prosesləri dərindən bilməsi onun siyasi peşəkarlığının, siyasi erudisiyasının genişdiapazonlu olmasından xəbər verirdi. Heydər Əliyevin bu fikirlərinə diqqət yetirin: "... Xatirinizdədir ki, 1991-ci il avqustun 30-da Azərbaycan parlamenti müstəqillik haqqında bəyanat qəbul etdi. Ancaq görünür ki, Azərbaycan Respublikasının o vaxtkı rəhbərləri müstəqilliyi nədənsə istəmirdilər. Çünki bu aktları, şübhəsiz, vaxtında keçirmək olardı.

Belə bir bəyanat qəbul olunandan sonra xeyli vaxt keçdi və oktyabrın 18-də müstəqillik haqqında Konstitusiya Aktı qəbul edildi. Baxmayaraq ki, artıq o vaxt Sovetlər İttifaqı dağılırdı və bu, göz qabağında idi, ancaq Azərbaycan xalqının iradəsinə zidd olaraq o zaman Azərbaycan Respublikasının rəhbərliyi müstəqilliyə getmək istəmirdi. Nədənsə, görünür ümid bəsləyirdi ki, Sovetlər İttifaqı qalacaq, yaşayacaqdır". Bunları Heydər Əliyev ona görə xatırladır ki, millətin hər bir üzvü bilsin ki, hətta ayrı – ayrı qruplar belə müstəqil dövlət olmağımıza maneçilik göstərmiş, müstəqilliyi müvəqqəti hesab etmişlər. Sovetlər İttifaqının o vaxtkı prezidenti Qorbaçov Sovetlər İttifaqının dağılması barədə bəyanat versə də, o vaxtkı Azərbaycan rəhbərliyi 1991-ci ilin martında referendum keçirib qərar qəbul etdi ki, Sovetlər İttifaqı saxlanılmalıdır. Və 1991-ci il avqustun 30-da müstəqillik haqqında bəyanat qəbul ediləndən sonra oktyabrın 18-də dövlət müstəqilliyi haqqında Konstitusiya Aktı qəbul olundu. Bu Konstitusiya Aktından sonra referendum keçirilə bilərdi. Ancaq bu referendum uzadılmış və dekabrın 30-a salınmışdır.

Heydər Əliyev qeyd edirdi ki, "Bütün bunlara baxmayaraq, 1991-ci il oktyabrın 18-də qəbul olunmuş dövlət müstəqilliyi haqqında Konstitusiya Aktı çox dəyərli sənəddir. Bu sənəddə Azərbaycanın müstəqilliyi və müstəqil dövlət kimi dövlət quruculuğu haqqında çox dəyərli müddəalar öz əksini tapıbdır".

Heydər Əliyev ümumiləşdirmə aparmaq bacarığı ilə öz dinləyicisini inandırmağa qadir olan bir şəxsiyyət idi. O, ya faktları, hadisələri şərh edərək ümumiləşdirmə aparırdı, ya da ümumiləşdirici məntiqdən, fikirdən, mövqedən konkret olaraq faktların, hadisələrin şərhinə keçirdi. Və bu zaman rabitəni, əlaqəni elə qururdu ki, onun verdiyi informasiya qarşı tərəfi təmin edirdi, anladırdı, etiraz etməyə, bitərəf qalmağa yer qalmırdı. Fikir verin, o, 1995-ci ildə qəbul olunmuş konstitusiyamıza qədərki dövrdə mövcud olmuş konstitusiyalar barəsində nə qədər konkret və ümumiləşdirici fikir söyləyir: "... 1919-cu ildə qəbul olunmuş müstəqillik haqqında Akt" - əgər biz onu konstitusiya xarakterli bir sənəd kimi qəbul ediriksə, - o, konstitusiya olmayıbdır. Ondan sonra – 1921-ci ildə, 1937-ci ildə və 1978-ci ildə qəbul olunan konstitusiyalar da, şübhəsiz ki, sovet hakimiyyəti dövründə qəbul edilən konstitusiyalardır. O vaxtlar Azərbaycan Respublikası müstəqil dövlət olmamışdır və şübhəsiz, bu konstitusiyalarda kommunist ideologiyası, sovet hakimiyyətinin prinsipləri öz əksini tapmışdır".

Heydər Əliyev 1995-ci ildə qəbul etdiyimiz konstitusiyamızın memarıdır. Bu konstitusiyanın hər sətrində, hər sözündə onun düşüncəsi, məntiqi kök salıbdır. O, hər şeydən əvvəl, konstitusiyamızın demokratik, hüquqi, sivilizasiyalı, dünyəvi prinsiplərə sadiq olmasını strateji maraqda saxlamış, dövlətin, xalqın və hər bir vətəndaşın hüquqlarının qorunmasına təminat verən sənəd olmasına nail olmuşdur. Heydər Əliyev 1995-ci il konstitusiyasının mayasının nə ilə

yoğrulacağını dəqiq bilirdi. Belə hesab edirdi ki, bu konstitusiyada insanların hüquqları, azadlıqları qorunmalıdır, demokratiya və siyasi plüralizmi, mətbuat, söz, din, dil azadlığı təmin edilməlidir. Eyni zamanda bu konstitusiya Azərbaycan Respublikasının uzun müddətdə müstəqillik yolu ilə getməsini təmin etməlidir.

Heydər Əliyev 1995-ci ildə qəbul olunmuş konstitusiyanın layihəsinin müzakirə olunmasını olduqca vacib sayırdı. O istəyirdi ki, layihə barəsində respublikanın dövlət və hökumət orqanlarının, elm, mədəniyyət, təhsil, yaradıcılıq, ictimai təşkilatların, ayrı–ayrı partiyaların, kütləvi informasiya vasitələrinin nümayəndələrinin fikirləri olsun. Ona görə də yeni konstitusiya layihəsinin geniş müzakirəsində alimlərimiz də fəal iştirak edir, bir sıra təkliflər irəli sürürdülər. Yeni konstitusiya layihəsinin bir maddəsinin – Azərbaycan Respublikasının dövlət dili haqqında maddənin geniş müzakirəsi Heydər Əliyevin təşəbbüsü ilə keçirilirdi. Əslində Heydər Əliyevin bu məsələdə alimlərlə birgə müzakirədə iştirak etməsi elmimizə, mədəniyyətimizə, ən başlıcası dilimizə olan böyük qayğıdan irəli gəlirdi.

1995-ci il oktyabrın 31-də respublika Elmlər Akademiyası Rəyasət Heyəti binasının iclas salonunda yeni konstitusiya layihəsinin bir maddəsinin – Azərbaycan Respublikasının dövlət dili haqqında maddənin müzakirəsi olmuşdur. Müzakirədə Azərbaycan Respublikasının Prezidenti Heydər Əliyev də iştirak etmişdir. Yığıncağa – müzakirəyə respublika Elmlər Akademiyası ədəbiyyat, dil və incəsənət bölməsinin akademik katibi Bəkir Nəbiyev sədrlik etmişdir. Heydər Əliyev bu yığıncaqda geniş nitq söyləmişdir. Onun nitqi respublikanın tanınmış alimləri, ziyalıları tərəfindən böyük diqqətlə dinlənilmişdir. Heydər Əliyevin konstitusiyamızın bir maddəsinin – Azərbaycanın dövlət dili haqqında olan 23-cü maddənin Elmlər Akademiyası Rəyasət Heyətinin binasında geniş müzakirə obyektinə çevrilməsi təsadüfi olmamışdır.

Hər şeydən əvvəl, Heydər Əliyev bu işin çox məsuliyyətli bir iş olduğunu yaxşı bilirdi. İkincisi, Azərbaycan xalqının tarixini (o cümlədən dilinin, konstitusiyasının və s.) dərindən bilirdi və bununla yanaşı, onların hər birini təhlil etmək istedadına malik idi.

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasının Konstitusiyası. Təhsil Qanunvericiliyinə dair normativ-hüquqi sənədlər toplusu. I cild. “Şərq-Qərb Nəşriyyat Evi”, 2012.

2. “Azərbaycan Respublikasının dövlət dili haqqında” Qanunu. “Azərbaycan” qəzeti, 2002, 30 sentyabr.

3. İbrahimov M. Gəlin gözəl danışaq. Dil mədəniyyəti. Bakı, 1979.

4. Xəlilov B. Doğma dil - milli ruhun daşıyıcısı. // Azərbaycan məktəbi, 2013, № 1.

**Б.Халилов**

**Задачи государственного языка всегда являлись одним из судьбоносных проблем**

**Резюме**

В статье повествуется о задачах государственного языка, просмативается пути развития государственного языка в Азербайджане.

**B.Khalilov**

**State language has always become the important issue**

**Summary**

In this article it is spoken about the state language and its background is investigated.

***İdarəetmə məsələləri***

# MƏKTƏBƏQƏDƏR TƏHSİLİN İDARƏ EDİLMƏSİNİN NORMATİV-HÜQUQİ ƏSASLARI

**Laləzar Cəfərova**
***pedaqogika üzrə fəlsəfə doktoru, dosent***

**Azadə Əhmədova**
***Yasamal rayonu 11 nömrəli uşaq bağçasının müdiri***

***Açar sözlər:*** *məktəbəqədər təhsil, pedaqoji proses, təhsilin modernləşdirilməsi, idarəetmə, normativ-hüquqi sənədlər.*

***Ключевая слова:*** *дошкольное воспитание, педагогический процесс, модернизация образования, управления, нормативно-правовые документы.*

***Key word:*** *preschool education, pedagogical process, modernization of education, management, normative legal documents.*

Təhsil müəssisəsinin idarəolunmasının dövlət-ictimai prinsiplər əsasında həyata keçirilməsi, pedaqoji proses iştirakçılarının fəaliyyəti üçün ən əlverişli şəraitin yaradılması, onların sosial müdafiəsi və perspektivdə ictimai-dövlət idarəetmə sisteminə keçilməsi müvafiq sənədlərdə qarşıya əsas məqsəd kimi qoyulmuşdur.

Ölkəmizdə Təhsil müəssisələrinin fəaliyyətini tənzimləyən normativ – hüquqi sənədlərdə təhsil sisteminin idarəolunması problemlərinə xüsusi münasibət bildirilmiş və demokratik cəmiyyətdə təhsilin idarəolunması, ona rəhbərlik və nəzarətin həyata keçirilməsinin humanistləşmə və demokratikləşmə prinsiplərinə uyğun şəkildə qurulması məqsədəuyğun sayılmışdır.

Müasir təhsil müəssisəsinin xüsusiyyətlərindən biri dövlət idarəetmə sistemindən dövlət-ictimai idarəetmə sisteminə keçilməsidir. Təhsilin dövlət-ictimai prinsiplər əsasında idarə edilməsinin əsas ideyası təhsil problemlərini həll etmək üçün dövlətin və cəmiyyətin səylərini birləşdirmək, tədris prosesinin məzmununu, forma və metodlarını, müxtəlif tip təhsil müəssisələrini seçməkdə müəllimlərə, şagirdlərə, valideynlərə böyük hüquqlar və azadlıqlar vermək təşkil edir. Təhsil sisteminin idarə olunmasının (o cümlədən məktəbəqədər təhsil müəssisələrinin) dövlət xarakteri o deməkdir ki, ölkədə təhsil sahəsində dövlətin vahid siyasəti həyata keçirilir.

Azərbaycan Respublikasında təhsil sahəsi prioritet sahə hesab olunur. Prioritetlik o deməkdir ki, ölkənin sosial-iqtisadi, siyasi, mədəni və beynəlxalq sahələrdə uğurları təhsil sistemi ilə əlaqələndirilir. Təhsil sisteminin idarə olunmasının dövlət xarakteri təhsil sahəsində dövlət siyasətinin prinsiplərində təsbit olunmuşdur. Həmin prinsiplər Təhsil haqqında Azərbaycan Respublikasının Qanununda qeyd olunduğu kimi təhsilin humanist xarakteri, təhsilin dünyəvi xarakteri, hamının təhsil almaq hüququna malik olması, təhsilin demokratik, dövlət-ictimai xarakter daşıması

və s. ifadə olunmuşdur.

Son illər respublikamızda məktəbəqədər təhsilə dövlət nəzarəti gücləndirilmişdir. Bu gün Azərbaycanda təhsilin bütün pillələrində olduğu kimi, məktəbəqədər təhsil pilləsində də əsaslı dəyişikliklər aparılır. Məktəbəqədər təhsilin modernləşdirilməsinin əsası 1999-cu ildə 15 iyun tarixdə ümummilli lider Heydər Əliyev tərəfindən təsdiq olunmuş "Azərbaycan Respublikasının təhsil sahəsində İslahat Proqramı"nda qoyulmuşdur.

Müstəqillik illərində Respublikamızda məktəbəqədər təhsil sahəsində mövcud normativ və hüquqi sənədlərin yeniləşdirilməsi zərurəti yarandı. Bu gün bu problemlər müəyyən qədər öz həllini tapıb. Artıq müvafiq sənədlər hazırlanmış və məktəbəqədər təhsil müəssisələrində tətbiq edilməyə başlanılmışdır.

Respublikanın Prezidenti cənab İlham Əliyev tərəfindən12 aprel 2007-ci il tarixdə "Azərbaycan Respublikasında Məktəbəqədər təhsilin yeniləşdirilməsi Proqramı" imzalanmışdır. Proqramda deyilir: "...məktəbəqədər təhsilin məzmunca yeniləşdirilməsi məqsədilə məktəbə hazırlıq baxımından uşaqların fiziki, sosial-mənəvi, estetik və psixoloji inkişafı, dərketmə və nitq qabiliyyətlərinin yüksəldilməsi üzrə əsas tələbləri özündə ehtiva edən, həmçinin pedaqoji prosesin humanistləşməsini nəzərdə tutan məktəbəqədər təhsil üzrə milli kurikulumun hazırlanması və müvafiq qaydada təsdiq olunmasıdır".

"Təhsil haqqında" Azərbaycan Respublikasının Qanununda işə məktəbəqədər təhsil təhsilin ilk pilləsi olmaqla, ailənin və cəmiyyətin maraqlarına uyğun olaraq, uşaqların erkən yaş dövründən intellektual, fiziki və psixi inkişafını, sadə əmək vərdişlərinə yiyələnməsini, istedad və qabiliyyətinin üzə çıxarılmasını, sağlamlığının qorunmasını, estetik tərbiyəsini, təbiətə və insanlara həssas münasibətinin formalaşmasını təmin etməsi bir vəzifə kimi qeyd olunur.

Məktəbəqədər hazırlığın təşkili qaydalarına əsasən, Təhsil haqqında qanuna uyğun hazırlanan bu qaydalar məktəbə hazırlığın təşkili məsələlərini tənzimləyir. Sənədə əsasən, 5 yaşlı uşaqlar üçün məktəbə hazırlıq zəruri hesab olunur. Lakin məktəbəqədər yaşlı uşağın təhsili onun inkişafının süni surətdə tezləşməsinə deyil, zənginləşdirilməsinə istiqamətləndirilməlidir. Məktəbəqədər təhsil müəssisələrində məktəbəhazırlıq qrupları 5 yaşdan 6 yaşadək uşaqları əhatə edir və mülkiyyət formasından asılı olmayaraq, bütün məktəbəqədər təhsil müəssisələrində 5 yaşlı uşaqlar üçün məktəbəhazırlıq qrupları təşkil olunmalıdır. Qaydalara əsasən, 5 yaşlıların məktəbə hazırlığı "Məktəbəqədər müəssisələrdə tərbiyə və təlim Proqramı" əsasında (məktəbəqədər təhsilin kurikulumu) həyata keçirilməlidir. Eyni zamanda yeni alternativ proqramlardan da istifadə oluna bilər.

Müasir dövrdə məktəbəqədər təhsilin problemlərinə çox böyük əhəmiyyət verilir. Bu məqsədlə Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2010-cu il 16 iyul tarixli, 137 nömrəli qərarı ilə "Məktəbəqədər təhsilin dövlət standartı və proqramı" təsdiq edilmişdir. "Məktəbəqədər təhsilin dövlət standartı və proqramı" (bundan sonra - dövlət standartı) "Təhsil haqqında" Azərbaycan Respublikası Qanununun 6.3-cü maddəsinə uyğun hazırlanmışdır və tabeliyindən, mülkiyyət formasından asılı olmayaraq, respublikada fəaliyyət göstərən bütün məktəbəqədər təhsil müəssisələrinə şamil olunur və bu tipli təhsil müəssisələrində məktəbəqədər təhsilin vəzifələrinin yerinə yetirilməsinə, tədris-metodiki rəhbərliyin tələblərinə əməl olunmasına dövlət nəzarətinin həyata keçirilməsini təmin edir.

Proqramda məktəbəqədər təhsil müəssisələri şəbəkəsinin optimallaşdırılması və

maddi-texniki bazanın möhkəmləndirilməsi, idarəetmənin yeni iqtisadi münasibətlər zəminində təkmilləşdirilməsi, təşkilat-hüquqi və iqtisadi mexanizmlərin bu müəssisələrin səmərəli fəaliyyətinə yönəldilməsi, məktəbəqədər təhsil xidmətlərinin əhalinin aztəminatlı təbəqəsinin imkanlarına uyğun olması, kadr təminatının yaxşılaşdırılması, yeni kurikulumun hazırlanması, bütövlükdə məktəbəqədər təhsilin ictimai statusunun yüksəldilməsi önəmli vəzifələr kimi qarşıya qoyulub, ən başlıcası isə dünya təcrübəsinə uyğun olaraq 5 yaşlı uşaqların zəruri məktəbəqədər təhsilə cəlb olunması, məktəbəqədər təhsil haqqında ayrıca qanunun qəbul edilməsi nəzərdə tutulub. Bununla müstəqil Azərbaycanın məktəbəqədər təhsil tarixində yeni mərhələnin təməli qoyulmuşdur.

Məktəbəqədər təhsil proqramı (kurikulumu) məktəbəqədər təhsilin dövlət standartı və proqramına əsasən hazırlanmışdır. Bu sənəd daim dəyişən cəmiyyətin tələbatına uyğun olaraq, inteqrasiya olunmuş həyati bacarıqlara və fəaliyyətə əsaslanır.

Azərbaycan cəmiyyətinin tələb və ehtiyaclarına uyğun, son illərdə nəticəyönümlü, yəni təhsil sistemində əldə olunması nəzərdə tutulan təlim nailiyyətlərinin nəticələr formasında qabaqcadan müəyyən edilməsi və müvafiq nəticələrdən ibarət şəxsiyyətyönümlü təhsil sisteminin yaradılması sahəsində xeyli işlər görülmüşdür. Məktəbəqədər təhsilin təlim nəticələrindən ibarət yeni məzmun, yeni təlim strategiyaları və uşaq nailiyyətlərinin qiymətləndirilməsi sistemi hazırlanmışdır.

Məktəbəqədər təhsilin kurikulumu hazırlanarkən şəxsiyyətyönümlülük, nəticəyönümlülük, uşaqyönümlülük, inteqrativlik, tələbyönümlülük, millilik və dünyəviliyin nəzərə alınması, hər bir uşağın inkişafı üçün bərabər imkanların yaradılması, uşaqların məktəb təliminə hazırlanmasının zəruriliyi kimi prinsiplər əsas götürülmüşdür. Şəxsiyyətyönümlülük təhsil proqramının (kurikulumun) məqsəd və məzmunu ilə bağlı olub, cəmiyyət üçün yararlı üzvün formalaşdırılmasının yerinə yetirilməsini təmin edir. Məktəbəqədər təhsilin kurikulumu kompleks sənəd kimi yeni struktura malikdir. Sənəd məktəbəqədər təhsilin məzmunu, təlim strategiyaları və uşaq nailiyyətlərinin qiymətləndirilməsini əhatə edir. Məktəbəqədər təhsilin məzmunu dedikdə bu sahədə məzmun standartları başa düşülür. Onların müəyyənləşdirilməsi və təsdiq olunması perspektiv fəaliyyət üçün zəruri hesab edilir. Həmin standartlar uşaqların inkişafını izləmək və istiqamətləndirmək üçün ardıcıl qiymətləndirmə aparmağa imkan yaradır.

Standartlar dövlət tələbidir. Dəyişilmir. Standartlar bütün yaş qrupları üçün eynidir. Lakin yaş qrupuna uyğun olaraq, alt standartlar tədricən mürəkkəbləşir və dəyişir. Hər bir standart bilik qazanmaq və fəaliyyətlə bağlıdır. Bütün fəaliyyətlərdə uşağın təfəkkür fəallığının inkişaf etdirilməsinin, psixomotor bacarıqların formalaşdırılmasının ön planda dayanması zəruri tələb kimi diqqət mərkəzində dayanmışdır.

Təlim strategiyaları təlim prosesinin təşkilinə verilən tələbləri, istifadə edilən forma, üsul, vasitələri və pedaqoji texnologiyaları əhatə edir. Yeni kurikulumlarda təlim strategiyaları anlayışının işlənməsi və pedaqoji prosesin təşkilində ondan daha səmərəli şəkildə istifadə olunması, ilk növbədə, əsas pedaqoji anlayışlardan biri kimi təhsilin müasir tələblər baxımından izahını tələb edir.

Məktəbəqədər təhsil müəssisələrinin və uşaq evlərinin pedaqoji şuraları haqqında Nümunəvi Əsasnaməsinə əsasən, pedaqoji şura məktəbəqədər təhsil müəssisəsinin idarəolunmasının şəffaflığını təmin etmək məqsədi ilə təhsil müəssisəsində tərbiyəçilərlə aparılan metodiki və uşaqlarla təşkil edilən tədris-təlim işləri üzrə mühüm məsə-

lələrə baxılması üçün daim fəaliyyətdə olan ali idarəetmə orqanıdır. Pedaqoji şuranın yaradılması və fəaliyyəti əsasnaməyə uyğun olaraq, məktəbəqədər təhsil müəssisəsinin təsisçisi tərəfindən təsdiq olunmuş əsasnaməyə və təhsil müəssisəsinin nizamnaməsinə əsasən müəyyən edilir.

Sənəddə pedaqoji şuranın fəaliyyət istiqamətləri, hüquqları, vəzifələri göstərilir. Şuranın əsas vəzifəsi uşaqlarla aparılan tədris-tərbiyə işinin keyfiyyətini yüksəltmək, pedaqoji elmlər sahəsində olan nailiyyətlərdən, yeniliklərdən və qabaqcıl iş təcrübələrindən istifadə etmək, tərbiyəçilərin pedaqoji iş qabiliyyətini yüksəltmək, yaradıcılıqlarını inkişaf etdirmək, məktəbəqədər təhsil müəssisələrində yeni interaktiv təlim metodlarından istifadə üzrə işi təkmilləşdirməkdir.

Məktəbəqədər müəssisələrin nümunəvi nizamnaməsi təhsil haqqında qanuna əsasən hazırlanıb və tabeliyindən, təşkilati-hüquqi formasından asılı olmayaraq, bütün məktəbəqədər təhsil müəssisələrinin fəaliyyətini tənzimləyir. Məktəbəqədər təhsil müəssisəsi mülkiyyət növünə görə dövlət, bələdiyyə və özəl məktəbəqədər təhsil müəssisələrinə bölünür. Sənəddə məktəbəqədər təhsil müəssisəsinin növləri, yaş qrupları, hər bir qrupda uşaqların sıxlığı və s. müəyyənləşdirilmişdir. Eyni zamanda sağlamlıq imkanları məhdud uşaqlar üçün xüsusi uşaq bağçalarının növləri də müəyyən edilmişdir.

Nəzərdən keçirdiyimiz sənədlərin hamısı məktəbəqədər müəssisələrdə pedaqoji prosesin təşkili və səmərəli idarəolunmasına xidmət edir və bu müəssisələrin inkişafına geniş imkanlar açır.

*Rəyçi: prof. A.Mehrabov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Məktəbəqədər təhsilin dövlət standartları və proqramı (kurikulumu). RNK-nın 16 iyul 2010-cu il qərarı ilə təsdiq edilmişdir.

2. Məktəbəqədər təhsilin proqramı (kurikulumu). RNK-nın 10 iyul 2012-ci il qərarı ilə təsdiq edilmişdir.

3. Məktəbəqədər təhsil müəssisələrinin və uşaq evlərinin pedaqoji şuraları haqqında Nümunəvi Əsasnamə. RNK-nın 9 avqust 2012-ci il qərarı ilə təsdiq edilmişdir.

**Л.Джафарова,**
**А.Ахмедова**

**Нормативно-правовая база по управлению дошкольным образованием**

**Резюме**

Управление дошкольным учреждением осуществляется в соответствии с Законом АР “Об образовании”, Типовым положением о дошкольном образовательном учреждении, Уставом ДОУ и строится на принципах единоначалия и самоуправления, призванных обеспечить государственно-общественный характер управления.

Все документы, указанные в дошкольных образовательных учреждениях служат для организации и управления педагогическим процессом.

**L.Cafarova,**
**A.Ahmadova**

**Normative legal bases of managing preschool education**

**Summary**

Management of pre-school institution is based on Standard Education, (Statement of preschool education, the Charter of the Dow) and on the principles of government management. All documents referred to preschool institutions are used to organize and manage the pedagogical process.

# TƏLİMİN SƏMƏRƏLİ TƏŞKİLİNİN KEYFİYYƏTƏ TƏSİRİ

**Rafiq Şahverdiyev**
***253 nömrəli tam orta məktəbin direktoru***

Qaradağ rayonunun tanınmış təhsil ocaqlarından biri də 253 nömrəli məktəbdir. Bu məktəb Təhsil Nazirliyinin əmri əsasında həm pilot məktəb, həm də Bakı şəhəri üzrə Təhsil idarəsinin koordinator məktəbi kimi fəaliyyət göstərir. Burada 34 sinfi əhatə edən 802 şagirdin təhsil və tərbiyəsi ilə 90 müəllim məşğul olur. Müəllimlərin 84 faizi ali təhsillidir. Artıq 20 ildən çoxdur ki, Laçın rayonunun 7 nömrəli məktəbi də bu binada yerləşir. Onun üçün 9 sinif otağı ayrılmışdır. Ayrı-ayrı vaxtlarda bu məktəbin dam örtüyü, kommunikasiya xətləri, istilik sistemınə də əl gəzdirilmişdir. Hazırda isə, bu məktəb 2012-2013-cü tədris ilinin əsaslı təmir proqramına daxil edilmişdir.

Təhsilimizin inkişafı yolunda, təhsil sistemində beynəlxalq standartlara uyğun islahatların aparılması, təhsilin inkişafı və onun maddi-texniki bazasının möhkəmləndirilməsi barədə 30 Mart 1998-ci ildə ulu öndər Heydər Əliyevin “Azərbaycan Respublikasında təhsil sahəsində islahatlar üzrə dövlət komissiyası yaradılması haqqında” sərəncamı, möhtərəm Prezidentimiz İlham Əliyevin 21 avqust 2004-cü ildə “Azərbaycan Respublikasında ümumtəhsil məktəblərinin informasiya və kommunikasiya texnologiyaları ilə təminatı proqramı” barədə sərancamı və ümumiyyətlə, təhsilin inkişafını əhatə edən 17-dən çox sərəncamın imzalanması təhsilimizin maddi-texniki bazasının sürətli inkişafına zəmin yaratdı. Məhz bunların nəticəsidir ki, bu gün respublikamızın ən ucqar kəndlərində dünya standartlarına cavab verən müasir məktəblər tikilmiş və əsaslı təmir olunmuşdur.

Bu gün respublika məktəblərində hər 29 şagirdə bir kompyuter düşür ki, bu rəqəm bizim məktəbimizdə hətta 18 şagirdə bir kompyuter nisbətindədir. Məktəbimizdə İKT avadanlıqları ilə təchiz edilmiş 47 kompyuterdən ibarət 4 kompyuter otağı, 1 proyektor, 1 noutbuk vardır ki, bütün otaqlar, direktor kabineti və 3 ibtidai sinif otağı lokal və internet şəbəkəsinə qoşulmuşdur. Hazırda həmin ibtidai siniflər dərslərini İKT tədbiqi ilə müasir səviyyədə qurmağa çalışırlar.

Məktəbimiz fəaliyyətini aşağıda qeyd olunan qanun və normativ sənədlərə istinadən qurur:

- Azərbaycan Respublikasının Təhsil Qanunu
- Ümumtəhsil məktəblərinin nümunəvi Nizamnaməsi
- Ümumtəhsil məktəblərinə şagirdlərin qəbulu və yerdəyişməsi haqqında qaydalar
- Ümumtəhsil müəssisələrində pedaqoji şuranın əsasnaməsi

Pedaqoji kollektiv “təhsildə şəxsiyyətin azad inkişafının üstün tutulması və bərabərhüquqlu subyektə çevrilməsi” problemi üzərində işləyir.

Məktəbimizdə şagird və müəllimlərə göstərilən psixoloji xidmət təhsilin keyfiyyətinin yüksəldilməsinə və pedaqoji əməkdaşlığın düzgün təşkilinə öz töhfəsini verməkdədir. Məktəb-valideyn, ailə, mühit və informasiya əlaqələrinin böyük əhəmiyyət kəsb etdiyini nəzərə alaraq məktəb şurası yaradılmışdır.

2011/2012-ci tədris ilindən Bakı şəhərinin hər bir rayonundan bir məktəb olmaqla, o cümlədən bizim məktəbdə II sinifdən başlayaraq çox uğurla şahmat dərsləri keçirilir.

Təhsilin keyfiyyətinin yüksəldilməsi üçün onun məzmununda aparılan islahatlar, kurikulumların tətbiqi məktəbimizdə uğurla həyata keçirilir ki, bu da müasir həyata hazır olan şəxsiyyətin formalaşmasına xidmət etməklə, nəticəyönümlü və inkişafetdirici xarakter daşıyır, həm təhsil verənin, həm də təhsil alanın fəaliyyət mexanizmini müəyyən edir.

Təhsil islahatlarının əsas məqsədlərindən biri interaktiv təlim metodlarının təlim prosesinə tətbiqi vasitəsi ilə dərsin keyfiyyətinin yüksəldilməsidir. Bu üsullar dərsi çox maraqlı və cəlbedici etməklə, onun səmərəliliyini artırır, şagirdlərin dərketmə qabiliyyətini daha da fəallaşdırır, passivliyinin aradan qaldırılmasına, təfəkkürünün inkişafına, yaradıcılığının formalaşdırılmasına, demokratikləşdirilməsinə, humanistləşdirilməsinə, differensiallaşdırma, fərdiləşmə kimi prinsipləri həyata keçirməyə geniş imkanlar yaradır.

Məhz müəllimlərimizdən yaşlı və orta nəslin nümayəndələrindən riyaziyyatçılardan Sabir Süleymanlı, fiziklərdən Nərgiz Nəcəfova, ingilis dilindən Səmayə Mehdiyeva, Səltənət Mənsimova, Məlahət Həsənova, bioloqlardan Cəmilə Abseynova, Mətanət Əliyeva, kimyaçılardan Gülnaz Qasımova, ədəbiyyatçılardan Nailə Cəlilova, coğrafiyadan Təranə Camalova, tarixçilərdən Elşad Vəliyev, ibtidai sinifdən Səbinə Kərimova, gənc nəslin nümayəndələrindən-ədəbiyyatçılardan İlahə Mirzəliyeva, Günay İbişova, Aliyə Quliyeva, riyaziyyatçılardan Şəlalə Niftalıyeva, ingilis dilindən Samirə Quliyeva bu gün dərslərini ənənəvi üsulla deyil, təfəkkürün inkişaf etdirilməsi əsasında biliklərin şagirdlər tərəfindən daha çox müstəqil əldə edilməsi və mənimsənilməsi, bacarıq və vərdişlərin, şəxsi keyfiyyət və qabiliyyətlərin qazanılmasına xidmət edən formada qurmağa çalışırlar. Burada İKT-nin tətbiqi böyük əhəmiyyət kəsb edir. Bununla yanaşı, təhsilin keyfiyyətinin yüksəldilməsi məqsədilə bilik yarışlarının, gecələrin və debatların keçirilməsi də əsas məqsədə xidmət edir.

Son 3 ildə məzunlarımızın ali məktəbə qəbulu nəticələrinə nəzər salsaq görərik ki, qəbul faizi ilbəil artır. Belə ki, 2009-cu ildə sənəd verən 81 nəfərdən 30-u (37%), 2010-cu ildə 77 nəfərdən 41-i (53%), 2011-ci ildə isə 62 nəfərdən 40-i (65%) ölkənin müxtəlif ali məktəblərinə qəbul olmuşlar. Bu məzunlarımızın 30%-i 300-500 arası, 10%-i 500-700 arası, 2 nəfəri isə 600-dən yuxarı bal toplamışlar. Təhlil göstərir ki, son 3 ildə qəbul 28% artmışdır. Ölkə üzrə məktəb məzunlarının fənlər üzrə düzgün cavablarının reytinqi ilə müqayisəsi göstərir ki, məktəbimizin 2009-cu ildə 4 fəndən göstəriciləri aşağı olmuşdursa, 2011-ci ildə bütün fənlər üzrə orta göstəricidən yuxarı olmuşdur.

2009-cu ildə məktəb məzunlarının fənlər üzrə orta bal göstəriciləri respublika və şəhərlə müqayisədə 3 fəndən aşağı olmuşdursa, 2010-2011-ci ildə bu göstəricilər həm şəhər, həm də respublika üzrə göstəricilərdən nəzərəçarpacaq dərəcədə çox yüksək olmuşdur. Bütün bunlar nəticələri zəif olan fənlərin tədrisində zəifliklərin aradan qaldırılması istiqamətində aparılan tədbirlər nəticəsində əldə olunmuşdur ki, son 3 ilə orta bal 73 bal artaraq, 220-dən 293-ə çatmışdır.

Məktəb işinin planlaşdırılmasında və görülən işlərin təhlilində direktoryanı müşavirə və metodbirləşmə iclaslarının böyük əhəmiyyəti vardır. Direktoryanı müşavirələrdə məktəbin fəaliyyət planına əsasən görülən işlərin təhlili, problemlər, nöqsanlar, görüləcək işlər təhlil olunur və lazımi təd-

birlər görülür.

Məktəbin uğurları bunlarla kifayətlənmir, ayrı-ayrı olimpiadalarda, inşa müsabiqələrində, müxtəlif bilik yarışlarında uğur qazanan şagirdlərimiz çox olmuşdur. Bunlardan ulu öndər Heydər Əliyevin anadan olmasının 89-cu ildönümü ilə əlaqədar keçirilən respublika üzrə inşa müsabiqəsində IV yeri tutan Nuranə Verdiyevanın, Günay Sadiqovanın, respublika olimpiadasının iştirakçıları Sahib Tağızadənin, Rəşid Məmişovun, müxtəlif respublika və beynəlxalq səviyyəli yarışlarda uğur qazanmış tennisçi Sahilə Xudiyevanın, güləşçi Murad Hüseynzadənin, rəssam Cəmilə Qasımovanın, 600-dən yuxarı bal toplayan Nicat Rəhmanlının 635 bal, Nəzirə Pənahlının 604 bal, hələ XI sinfi bitirərkən müxtəlif müsabiqələrin qalibi və həmçinin şeir kitabının müəllifi Vüqar Əliyevin adlarını çəkmək istərdim. Bizim üçün çox sevindiricidir ki, 2012-ci ildə "ən yaxşı ümumi təhsil müəssisəsi" müsabiqəsinin qalibi olmaqla bərabər, 2011/2012-ci tədris ilinin qəbulunun nəticələri də çox uğurlu olmuşdur. Məktəbi bitirən 59 məzunumuzdan 34-ü ali məktəblərə qəbul olmuşdur ki, bu da sənəd verənlərin 60%-i deməkdir. 3 məzunumuz 600-dən çox bal toplamışdır. Bunlardan Məmişov Rəşid - 680 balla Prezident təqaüdünə layiq görülüb. Qubadlı Mehriban və Tağızadə Sahib 634 bal toplamışlar.

2011-ci ildə Təhsil Nazirliyinin, İdman və Turizm Nazirliyinin dəstəyi və Fövqəladə Hallar Nazirliyinin təşkilatçılığı ilə Bakı şəhəri məktəbliləri arasında keçirilən "Gənc yanğınsöndürənlər və xilasedicilər" yarışında məktəbimizin komandası 3 nominasiyada II yeri tutaraq, FHN-nin II dərəcəli fəxri fərmanları və qiymətli hədiyyələri ilə təltif olunmuşlar.

Məktəb bir sıra layihələr həyata keçirmişdir ki, bunlardan biri də "Ortaq məktəblərdə yerli-məcburi köçkün şagirdlər arasında qarşılıqlı sosial əlaqələrin inkişaf etdirilməsi, stimullaşdırılması" layihəsi əsasında "Dünya Bankı və Yaponiyanın Sosial İnkişaf Bankı" nın donorluğu, Beynəlxalq Avrasiya Mətbuat fondunun təşkilatçılığı ilə aparılan layihədə qalib olmuş və nəticədə məktəbə xeyli miqdarda idman avadanlıqları verilmiş, onlar tərəfindən müxtəlif tədbirlər keçirilmişdir.

Bildiyimiz kimi, şagirdin asudə vaxtı nə qədər səmərəli və məzmunlu olarsa, onun təlim müvəffəqiyyəti də bir o qədər yüksək olar. Məktəbimizdə mütəmadi olaraq, asudə vaxtın səmərəli təşkili üçün muzeylərə, tarixi abidələrə, görməli yerlərə ekskursiyalar təşkil olunur.

Məktəbimizdə şagirdlər və müəllimlərimizin istifadəsində olan zəngin kitabxanamız və qiraət zalımız vardır. Xüsusi istedada malik olan uşaqların yaradıcılıq potensialının inkişafı üzrə Dövlət Proqramına uyğun olaraq məktəbdə istedad bankı yaradılmışdır, Aysel Şirəliyevanın müəllifliyi ilə hazırlanan "İstedad sorağında" kitabında istedadlı şagirdlərimizin bir qrupundan yazılar dərc olunmuşdur.

Məktəbimizdə dövlət bayramları, qan yaddaşı günləri, "20 Yanvar", "Xocalı" faciələri və digər tədbirlər müntəzəm olaraq keçirilir. Şagirdlərimizin əl işlərindən ibarət sərgilər, nümayişlər, gül bayramı və sair kimi tədbirlərin keçirilməsi də ənənə halını almışdır.

Kollektivimiz əldə olunan nəticələrlə heç də kifayətlənməyərək respublikamız, vətənimiz üçün daha savadlı, daha dünyagörüşlü vətənpərvər övladların yetişdirilməsi üçün səylərini bundan belə də davam etdirəcəklər.

***Bizim iş yoldaşlarımız***

# AXTARIŞLAR DAVAM EDİR

**Nəcəf Nəcəfov**
***Azərbaycan Yazıçılar Birliyinin üzvü,***
***ADPU-nun dosenti, əməkdar müəllim***

Görkəmli tədqiqatçı, zəhmətkeş alim, yüksək intellektli ziyalı, sadə, təvazökar və səmimi insan Himalay Ənvər oğlu Qasımov on ildən çoxdur ki, Azərbaycan Dövlət Pedaqoji Universitetində "Azərbaycan ədəbiyyatı tarixi" kafedrasına rəhbərlik edir. Bütün həyatı boyu elmin zirvəsinə gedən yolda fədakarlıqla çalışan Himalay Qasımov gərgin əməyi, böyük zəhməti, min bir əzabı nəticəsində ədəbiyyatımızın tədqiqi sahəsində əhəmiyyətli işlər görmüş, sanballı əsərləri ilə elmimizə dəyərli töhfələr bəxş edərək yeni-yeni yaradıcılıq uğurları əldə etmişdir.

Ədəbiyyatşünas, ədəbiyyat tarixçisi və nəzəriyyəçisi kimi tanınan filologiya elmləri doktoru, professor Himalay Qasımov ağır və şərəfli bir həyat yolu keçmişdir. O, Naxçıvan şəhərində ziyalı ailəsində doğulmuşdur. Atası Ənvər Hacı Qasım oğlu dağ-mədən ixtisası üzrə ali təhsil alaraq, Naxçıvanda mühəndislik vəzifəsində çalışmışdır. Bu ailənin maraqlı tarixçəsi vardır. Akademik M.C.Cəfərovun akademik İsa Həbibbəyli tərəfindən hazırlanıb çap edilmiş "Xatirələr" (Bakı, 2010) adlı memuarında Himalay müəllimin babası Hacı Qasım Naxçıvanda ən imkanlı və sayılıb-seçilən şəxslərdən biri kimi tanıdılmışdır. Məlumdur ki, o zamanlar həccə getmək hər kəsə müyəssər olmurdu. Ancaq onun babası müqəddəs müsəlman şəhəri olan Məkkəni ziyarət etmiş, hacı adı almış ürfan simalardan biri olmuşdur. Onun ömür-gün yoldaşı Zöhrə xanım da səxavətli bir xanım kimi ad qazanmışdır. Bu ailə Qaçaq Nəbinin hörmət bəslədiyi, güvəndiyi, yeri gəldikcə sığındığı ailələrdən idi. Yaşadığı mahalda mərd bir kişi kimi tanınan Hacı Qasım öz qürurunu, mənliyini axıradək qorumuşdur. Çoxdan hədəfə alınmış bu cəsur insan 1918-ci ildə özünün kəhər atında Naxçıvandan Ordubada gedərkən Araz kənarında Aza kəndi yaxınlığında erməni cəlladları ilə qeyri-bərabər döyüşdə həlak olmuşdur. Valideynləri balaca Himalaya keçmişlərindən fəxrlə danışırdılar. Onun anası Kəngərlilər tayfasındandır. Kəngərlilər də Naxçıvanda tanınmış nəsildir. Şahtaxtı kəndində bu ailəyə hörmətlə yanaşılır. Lakin ruzigarın sərt üzü isə bu ailədən əl çəkmirdi. Böyük Vətən müharibəsi yeni faciələrin başlanğıcı oldu. Müharibənin ağrı-acıları bu ailədən də yan keçmədi. 1943-cü ildə onun atası Ukrayna uğrunda döyüşlərdə həlak olmuşdur. Yüzlərcə, minlərcə ailələrin başına gələn bu fəlakətlərlə onlar da üzləşmişlər. Bundan əvvəl tüğyan edən 37-ci il hadisələrində də ailəyə ağır zərbə dəymiş, əmisi həbs edilmişdi. Üçlüyün döydüyü qapıdan çıxan Həmzə müəllim 30-cu illərin yetkin ziyalılarından idi. O, Azərbaycan Dövlət Universitetinin tarix fakültəsini Mehdi Hüseynlə birgə bitirmişdi. Digər günahsız qurbanlar kimi, o da 1937-ci ildə Sibirə sürgün olunmuş, 18 il dözülməz həyat sürmüşdür. Tale elə gətirmişdi ki, bu dəhşətli günlərdə o, həmyerlisi böyük şair Hüseyn Cavidə qayğı göstərməli olmuşdur. Bu barədə kifayət qədər xatirələr də vardır. ADPU-nun profes-

soru Quşdan Bağırov "Azərbaycan müəllimi" qəzetində yazırdı ki, böyük şair Hüseyn Cavid fani dünya ilə öz həmyerlisi Həmzə Qasımovun dizləri üstə vidalaşmışdır. Həmzə müəllim ağır sürgün illərindən sonra bəraət alaraq vətənə dönmüş, öz doğma təhsil ocağında işə bərpa olunaraq, on bir il tarix-filologiya və tarix fakültələrinin dekanı vəzifəsində çalışmışdır. Bütün bu illərin ağırlıqları heç də Qasımovlar ailəsini, o cümlədən gənc Himalayı sarsıtmamış, əksinə, onları mətinləşdirmiş, daha dözümlü etmişdir.

Himalay müəllimin ömür yoluna nəzər salanda bütün bunların kökündə onun nəsil şəcərəsinin, böyüdüyü və tərbiyə aldığı mühitin, həmçinin mətin iradəsinin dayandığına əmin oluruq.

Gənc yaşlarından bu hisləri yaşamış Himalay müəllim özü üçün müəllimliyi peşə seçmiş, həyatını gənc nəslin təlim-tərbiyəsinə həsr etməyi hər şeydən üstün tutmuşdur. 1961-ci ildə Azərbaycan Pedaqoji İnstitutunun (ADPU-nun) tarix-filologiya fakültəsinə qəbul olan bu gənc böyük müəllimləri olan akademik Feyzulla Qasımzadə, Əli Sultanlı, Mikayıl Rəfili kimi nəhənglərdən dərs almış, 1966-cı ildə oranı bitirərək Azərbaycan dili, ədəbiyyatı və tarix müəllimi kimi doğma şəhərinə qayıtmış, Naxçıvanda 2 nömrəli şəhər orta məktəbində ixtisası üzrə müəllim işləmiş, tam üç il (1966-1969) bu doğma ocaqda ədəbiyyat və tarix fənlərini tədris etmişdir.

Bir haşiyə: Himalay Qasımovun institutda qalmaq şansları çox idi. O, 1965-ci ildə tələbə elmi cəmiyyətinin xətti ilə Xalq şairi Səməd Vurğunun müharibə mövzusunda yazdığı şeirlər barədə elmi iş yazmış və bu işin tezisləri çap olunmuşdur. İlk elmi əsəri kimi bu qeydlərdən o, indi də çox ürək yanğısı ilə danışır.

Himalay müəllim məktəbdə çox həvəslə işləyirdi. Şagirdləri də onu sevir, onu bu peşəyə daha yaxından bağlayırdılar. Təsadüfi deyildir ki, onun şagirdləri "qızıl" və "gümüş" medallara da layiq görülmüşdü. Həmin şagirdlər bu gün elmimizdə, təhsilimizdə vicdanla çalışan elm, təhsil fədailəridir. Himalay müəllim yalnız dərs deməklə qalmırdı. Qabaqcıl müəllim kimi, 1967-ci ildən ona eyni zamanda ADPU-nun Naxçıvan Muxtar Respublikası üzrə qiyabi məsləhət məntəqəsinin müdiri vəzifəsi də tapşırılmışdır. İşlədiyi müddətdə tez-tez Bakıya gələn, öz müəllimləri ilə əlaqə saxlayan Himalay müəllimi elm sahəsi daha çox cəlb edirdi. Tələbəlik illərində gənc Himalay öz həmyaşıdları içərisində uyğun taleləri də çox görmüşdü. Müəllimləri bir qədər ehtiyatlı davransalar da, 37-ci il hadisələrindən danışarkən istər-istəməz H.Cavidin, Ə.Cavadın, M.Müşfiqin, B.Çobanzadənin, Salman Mümtazın, Seyid Hüseynin acı taleyindən söhbət salınar, bu hadisələrə ədəbiyyatımızın faciəsi kimi baxılardı. Onun bütün bunları gözü ilə görən, şahidi olan əmisi Həmzə müəllim də bu barədə çox şey bilirdi. Bu söhbətlərin içərisində elmə həvəs göstərən Himalayın qəlbində Hüseyn Cavidin taleyi onu daha çox özünə cəzb edirdi. Təsadüfi deyildir ki, Himalay Qasımovun elmi fəaliyyətində Hüseyn Cavid mövzusu qırmızı xətlə keçmişdir. Həmzə müəllim o illəri xatırlayanda Himalay müəllim də o illərə baş vururdu. Düşünürdü ki, 1937-ci ildə repressiya alovu bütün Azərbaycanı bürüsə də kimsənin gücü yetməzdi ki, bu alovu söndürə bilsin. Elə buna görə də neçə-neçə qələm sahibləri repressiya alovunun oduna yanmışdılar. Bu dərdin atəşi xalqımızı bu gün də yandırır. O illər indi qorxulu nağıllar kimi xatırlanır. Bu qorxulu nağıllardakı obrazların əksəriyyəti vətənin "xalq düşməni" damğası vurulan ən dəyərli, namuslu övladları idi. Bütün bunlar gənc Himalaya öz təsirini göstərməmiş qalmırdı.

O zamankı tələblərə uyğun olaraq, üç

illik gənc mütəxəssis borcunu verdikdən sonra tale onu Bakıya gətirir, doğma kafedrası ilə bağlayır. Azərbaycan ədəbiyyatı tarixi kafedrasının dissertantı olaraq akademik F.Qasımzadənin elmi rəhbərliyi altında "Azərbaycan şeirində süjetli lirika" mövzusunda namizədlik dissertasiyası üzərində işləməyə başlayır. 1974-cü ildə dissertasiya işini uğurla başa çatdırır. Qeyd etmək lazımdır ki, 1970-ci ildən "Azərbaycan ədəbiyyatı tarixi və ədəbiyyatın tədrisi metodikası" kafedrasında baş laborant, eyni zamanda kafedranın saathesabı müəllimi kimi "Ədəbiyyatşünaslığa giriş" fənnindən dərs aparır. 1974-1975-ci tədris ilindən həmin kafedranın müsabiqə yolu ilə müəllimi vəzifəsinə seçilir. Beləliklə, tale kitabında səhifələr aramsız yazılmağa başlayır: baş müəllim, dosent, professor və kafedra müdiri. Ədəbi irsin, müasir tənqidin ən qlobal problemləri ilə məşğul olan H.Qasımov 1994-cü ildə "Müasir Azərbaycan romanı: janrın poetika və tipologiyası" mövzusunda doktorluq dissertasiyası müdafiə edir. Onu həmişə tələbələrinin taleyi düşündürmüş, o, tələbələrinə diqqət və qayğı ilə yanaşmışdır. Gənc alim araşdırmalarını da davam etdirirdi. Onun ilk dərs vəsaiti 1981-ci ildə nəşr olunur. "Ədəbiyyat nəzəriyyəsindən mühazirələr" adlı bu vəsait universitetin filologiya fakültəsinin IV kursunda tədris olunmağa başlayan "Ədəbiyyat nəzəriyyəsi" fənni üçün 1977-ci ildə ilk dəfə tərtib olunan proqrama uyğun olaraq hazırlanmışdı. Sonralar bunun davamı kimi Azərbaycan ədəbiyyatının yaradıcılıq problemlərinə dair kitablar, bakalavr və magistr təhsil pilləsində tədris olunan bir neçə fənn proqramlarını da çapa təqdim edir. O, ədəbiyyatşünaslığın təbliğinə geniş yer ayırır. Belə bir rəvayət var ki, Makedoniyalı İsgəndər Axillesin qəbrini ziyarət edərkən onun qəhrəmanlığını bir daha xatırlayır və elə oradaca üzünü Axillesin heykəlinə tərəf tutub deyir: Qəhrəmanlıq yadda qalandır. Lakin sən çox xoşbəxt qəhrəmansan ki, sənin Homer kimi təbliğatçın olmuşdur. Himalay müəllim də öyrəndiklərini zəruri bilik kimi tələbələrinə aşılamaq üçün əlindən gələni əsirgəmirdi.

Elmi tədqiqat işləri belə təbliğatın açarıdır. Bu açarı oxuculara verən alim tədqiq etdiyi sahəni həm də təbliğ edir, onu xalqın malı edir. Məhz bu fikirlərlə yaşayan Himalay müəllimin bu gün 16 kitabı, 120 məqaləsi dərc olunmuşdur. O, bu yolla mənəvi sərvətimizə öz töhfələrini vermişdir. Təsadüfi deyildir ki, bu illər ərzində o, xeyli sayda fundamental elmi məqalələrin müəllifi kimi ictimaiyyət tərəfindən təqdir olunmuşdur. Həm də o yalnız tədqiqatla, yazmaqla kifayətlənmir. O, onlarla monoqrafiyanın, dərsliyin və dərs vəsaitinə elmi redaktorluq edir. Qırxdan çox namizədlik və doktorluq dissertasiyasının rəsmi opponenti olmuşdur. Hazırda aktual mövzuda yazılan ondan artıq namizədlik dissertasiyasına elmi rəhbərlik edir. Yüzlərlə namizədlik və doktorluq dissertasiya işinin müzakirəsində rəy söyləyir və ya kafedra müdiri kimi həmin müzakirələrin gedişinə istiqamət verir. O, bu dissertasiyaların dərin elmi erudisiya və məntiqi təfəkkür fonunda müzakirəsinə həmişə məsuliyyətlə yanaşır. Bununla da öz məsləhət və tövsiyələrini elmi istiqamətə yönəldir. Təsadüfi deyildir ki, bu kafedrada ən tanınmış filoloqların doktorluq dissertasiyaları müzakirə olunmuşdur. Tanınmış alimlərdən BDU-nun professoru Cahangir Məmmədlinin, Nizami adına Ədəbiyyat İnstitutunun professoru Şirindil Alışanovun, BDU-nun professoru Şamil Vəliyevin və başqalarının çox dəyərli elmi axtarışlarına məhz bu kafedrada müsbət rəy verilmişdir. Aparıcı elmi müəssisə kimi, onlar barədə hər dəfə öz dəyərli sözünü demiş, xeyir-duasını vermişdir.

Prof. H.Qasımov eyni zamanda ölkənin müxtəlif təhsil və elm mərkəzlərində

fəaliyyət göstərən Dissertasiya Şuralarının üzvü kimi çıxış edib tövsiyələrini səsləndirir. “Azərbaycan ədəbiyyatı tarixi” kafedrasına rəhbərlik etdiyi on ildən bir qədər artıq müddətdə gənc alimlərin boy artımına xüsusi qayğı göstərilmişdir. Hal-hazırda kafedrada 8 elmlər doktoru, professor, 5 elmlər namizədi, dosent fəaliyyət göstərir. Onun yetirmələrindən bəziləri elmi-erudik imkanlarını səfərbər edərək ölkədə və ölkədən xaricdə müxtəlif elmi konfrans və simpoziumlarda dəyərli məruzələrlə çıxış edir və vətənə mükafatlarla qayıdırlar. Son illərdə Azərbaycan Dövlət Pedaqoji Universitetində elm və təhsil sahəsində rəqabət mühitini yaxşılaşdırmaq üçün həyata keçirilən “İlin alimi” və “İlin müəllimi” müsabiqəsində kafedranın professorları Elman Quliyev, Təyyar Salamoğlu, Mahmud Allahmanlı, dosenti Yaşar Rzayev qalib sayılmışlar. Məhz onun qayğısı nəticəsində kafedranın dosenti Ramin Əhmədov uğurla filologiya üzrə elmlər doktoru, Təranə Əzimova, Məlahət Babayeva, Səkinə Bayramova filologiya üzrə fəlsəfə doktoru adını almış, Pərvin Nurəliyeva, Yeganə Qasımova elmi araşdırmalar aparır. Ölkə və beynəlxalq miqyaslı naminasiyaların daşıyıcılarının fəaliyyət göstərdiyi “Azərbaycan ədəbiyyatı tarixi” kafedrasında işləmək, ona müdirlik etmək işini Himalay müəllim özünə şərəf sayır. Möhtəşəm tarixi, zəngin və yaşarlı ənənəsi olan belə bir kafedraya rəhbərlik etmək, dəyərli elm və təhsil fədailəri ilə çiyin-çiyinə işləməyə o, taleyin qisməti və zəhmətinin nəticəsi kimi baxır.

1996-cı ildə Azərbaycan Dövlət Pedaqoji Universitetinin “Azərbaycan və dünya ədəbiyyatı tarixi” kafedrasının professoru və 2003-cü ildə müdiri vəzifəsinə seçilən Himalay Qasımov ali məktəblərin filologiya fakültələri üçün “Ədəbiyyat nəzəriyyəsi”, “Müasir Azərbaycan ədəbiyyatı tarixi” proqramlarının, “Ədəbiyyat nəzəriyyəsindən mühazirələr” (1981), “Bədiiliyin meyarı” (1990), “Müasir Azərbaycan romanı: janrın poetika və tipologiyası” (1994), “Müasir Azərbaycan romanının qaynaqları (1994), “Azərbaycan şeirinin poetikası” (1996), “Müasir Azərbaycan ədəbiyyatında yaradıcılıq meyilləri” (1998), “Şəhriyarın lirikası və etiqadı” (1999), “Azərbaycan ədəbiyyatının yaradıcılıq problemləri” (2004), “Şəhriyar poetikası” (2006), “Səməd Vurğunun poetik dünyası” (2006) kimi dərs vəsaiti və monoqrafiyaların, Azərbaycan ədəbiyyatının yaradıcılıq problemlərinə dair çoxsaylı elmi-nəzəri məqalələrin müəllifidir. Bu sözlər görkəmli ədəbiyyatşünasın zəngin düşüncəsinin bariz ifadəsidir. Onun kitablarında və məqalələrində digər məsələlərlə yanaşı, eyni zamanda ədəbiyyatımızın cəfakeşləri olan tənqidçi və ədəbiyyatşünaslığın yaradıcılıq axtarış və uğurları, milli ədəbi-nəzəri fikrin kəsişməsi, estetik idrakının hüdudları, sosial-mənəvi gerçəklik zəminində sənət durğunluqları haqda konseptual mülahizələr də yürüdülür. Əsərlərinin tam olmayan siyahısı da göstərir ki, prof. H.Qasımov çoxcəhətli tədqiqat üslubuna malikdir. O, gah ədəbiyyatın nəzəri problemlərindən, gah sırf ədəbiyyatşünaslıq məsələlərindən, gah da klassiklərin yaradıcılıq problemlərindən bəhs edir və demək olar ki, hər dəfə də öz məqsədinə nail olur. Məsələn, o, XX əsr Azərbaycan ədəbiyyatşünaslıq məsələlərindən söz açarkən klassik ədəbi-estetik düşüncəni böyük ədəbi-mədəni hadisə hesab edirsə, klassik irsə meyil və marağın gündəmdən düşmədiyini bildirirsə, digər tərəfdən irs-varislik kontekstində ədəbiyyatşünaslığımızın bugünkü durumu, onun milli ədəbi-estetik qayəsi barədə fikir formalaşdırmağa səy edir və maraqlı mühazirələr söyləyir. Onun tədqiqatında mövzu rəngarəngliyi də diqqəti cəlb edir.

Bir haşiyə: H.Qasımovun “Mir Cəlal yaradıcılığında bir məqam” adlı məqalə-

sində hələ 50-ci illərdə ADPU-nun filologiya fakültəsinin sonuncu kursunda oxuyan, qiyabiçi tələbə, Şamaxıda müəllim işləyən Davud Orucovun Mir Cəlalın "Yaşıdlarım" romanı mövzusunda yazdığı kurs işini də tədqiqat obyekti kimi seçmişdir. Bu məqalədə həm Mir Cəlalın yaradıcılığı, həm də tələbə gəncin ilk uğurları öz gözəl ifadəsini tapmışdır.

Prof. H.Qasımov AMEA-nın Nizami adına Ədəbiyyat İnstitutunda və müxtəlif universitetlərdə İxtisaslaşdırılmış Dissertasiya Şuralarının üzvü olmuşdur. Hazırda BDU-da filologiya üzrə İxtisaslaşdırılmış Dissertasiya Şurasının üzvüdür.

Onun əsərləri barədə prof. Nərgiz Paşayeva, prof. Elman Quliyev, prof. Təyyar Salamoğlu, prof. M.Allahmanlı, prof. Yavuz Axundov, dos. Yaşar Rzayev, dos. Təranə Rəhimli, Füzuli Əsgərli, Hüseyn Həşimi və başqaları dəyərli fikirlər söyləmişlər. Filologiya elmləri doktoru, professor N.Paşayevanın H.Qasımovun "Azərbaycan dramaturgiyası: tarixilik və müasirlik" kitabına (2008) yazdığı "Ön söz"də deyilir: "Himalay Ənvəroğlunun dramaturgiyamızın inkişaf problemləri ilə bağlı konseptual açıqlamalarında, həmçinin tədqiqata cəlb olunan əsərləri janr poetikası haqqında da dolğun elmi təsəvvür yaradır. "Azərbaycan dramaturgiyası: tarixilik və müasirlik" kitabında da milli dramaturgiyamızın müxtəlif yaradıcılıq məsələlərinə dair araşdırmalar sərgilənmiş, dramaturji sənətin H.Caviddən Anara qədərki inkişaf yolunun müəyyən məqamları geniş təhlil edilmişdir".

Himalay müəllim həm də elm təşkilatçısıdır. Onun rəhbərlik etdiyi "Azərbaycan ədəbiyyatı tarixi" kafedrası ADPU-nun ən böyük fakültəsi olan filologiya fakültəsinin nəzdindəki 9 kafedradan biridir. Prof. Buludxan Xəlilovun rəhbərlik etdiyi bu fakültənin nəzdində olan kafedraların hər birinin Azərbaycan elminin və pedaqoji fikrinin inkişafında xüsusi xidmətləri vardır. Universitetin 85 və 90 illik yubileylərində fakültənin 16 əməkdaşı "əməkdar müəllim", "əməkdar elm xadimi" adına, "Tərəqqi" medalına layiq görülmüşdür. "Tərəqqi" medalı ilə təltif olunanlar arasında Himalay Qasımov da vardır.

Himalay Qasımov YAP-ın Səbail rayon təşkilatı idarə heyətinin üzvü, ADPU-da Yeni Azərbaycan Partiyası ərazi ilk təşkilatının sədridir. Universitetin elmi şurasının üzvüdür.

Fakültədə müntəzəm olaraq şairlərlə, yazıçılarla, ziyalılarla maraqlı görüşlər keçirilir, son vaxtlar Rəsul Rza, Cəfər Xəndan, Mir Cəlal, Zərifə Budaqova, Mirzə İbrahimov, İsmayıl Şıxlı və başqalarının yubiley tədbirlərinin yüksək səviyyədə keçirilməsində H.Qasımovun rəhbərlik etdiyi kafedranın əməkdaşlarının əməyi az olmamışdır. 1938-1939-cu dərs ilindən fəaliyyət göstərən bu kafedra öz qabaqcıllığı ilə yenə də fərqlənir. Kafedra ənənələrini qoruyur və saxlayır. Bu, onun nəticəsidir ki, prof. H.Qasımov öz sələfləri kimi, işinə sədaqəti ilə, möhkəm iradəsi və tükənməz enerjisi ilə kafedranın işini günün tələbləri səviyyəsinə istiqamətləndirməyə nail olur.

Himalay müəllim gözəl ailə başçısıdır. Onun həyat yoldaşı Elmira Qasımova tarix üzrə, qızı Səbinə Ağayeva fizika-riyaziyyat elmləri üzrə fəlsəfə doktorudur.

Həmişə təmkinli, səbirli olan prof. H.Qasımov müəllimlər və tələbələr arasında böyük hörmət və nüfuza malikdir. Onu əsl pedaqoq, rəhbər, səmimi insan kimi tanıyırlar. Kafedranın hər bir üzvü onu ən doğma, ən yaxın adam sayır.

Görülən işlər kafedra üzvlərini arxayınlaşdırmır. Prof. Himalay Qasımov yenə də yorulmadan çalışır. Onun ildə bir neçə kitabı nəşr olunur. Hər yeni kitabı izləyən oxucuda dərhal belə fikir yaranır: axtarışlar davam edir.

***Pedaqoji fikir tariximizdən***

# MAARİFÇİLİK VƏ TÜRKÇÜLÜK İDEYASININ TƏBLİĞİ TARİXİNDƏN

**Sərdar Quliyev**
***pedaqoji elmlər doktoru, professor***

**Mehparə Quliyeva**
***filologiya üzrə fəlsəfə doktoru***

***Açar sözlər:*** *maarifçilik, türkçülük, Azərbaycan bayrağı.*
***Ключевые слова:*** *просветительство, тюркизм, Флаг Азербайджана.*
***Key words:*** *enlightenment, Turkism, Azerbaijan flag.*

Azərbaycanda təhsilimizin və mətbuatımızın inkişafında, milli şüurun oyanmasında özünəməxsus xidmətləri olan dahi şəxsiyyətlərdən biri də Əlibəy Hüseynzadədir. Hüseynzadə (Əli Turan) 1864-cü il martın 8-də Salyan şəhərində anadan olmuşdur. O, ilk təhsilini evdə və mollaxanada almışdır. Atası Molla Hüseyn Tiflisə məktəb müəllimi təyin olunduqdan sonra Əlibəygilin ailəsi ora köçür. Lakin bir neçə ildən sonra atası vəfat edir və balaca Əli babasının himayəsinə keçir. Babası Şeyx Əhməd Salyani Qafqaz müsəlmanlarının ruhani başçısı - şeyxülislam olmaqla açıqfikirli bir şəxs idi. O, nəvəsi Əliyə ərəb, fars dillərində dini elmlərdən zəruri bilik verməklə yanaşı, onun Tiflis klassik gimnaziyasında təhsil alması qayğısına da qalır.

Bu istedadlı gənc 1885-ci ildə Tiflis gimnaziyasını müvəffəqiyyətlə bitirib ali təhsil almaq məqsədilə Peterburqa gedir. O, həkim olmaq istəyirdi. Lakin Peterburq universitetində tibb fakültəsi olmadığından təbiət-fizika fakültəsinə daxil olur. O, həm də universitetin şərqşünaslıq fakültəsində azad dinləyici kimi mühazirələrdə iştirak edir. Əlibəy Peterburq rəngkarlıq akademiyasının da məşğələlərinə gedir.

Ə.Hüseynzadənin Peterburq universitetində təhsil aldığı illər Rusiyada tələbə gənclər arasında inqilabi hərəkatın gücləndiyi dövrə təsadüf edir. Belə bir mühitdə Peterburq universitetini bitirən Əlibəy həkimlik təhsili almaq üçün İstanbula gedir. O, bütün maneələri dəf edərək Türkiyə proqramı əsasında ibtidai, orta və ali məktəblər üzrə bir neçə dəfə imtahan verir. Nəhayət, onu universitetin hərbi tibb fakültəsinə qəbul edirlər.

Əlibəy hələ gəncliyindən Avropa mədəniyyəti və ədəbiyyatı ilə yaxından tanış idi, üstəlik Rusiyadakı ictimai-siyasi vəziyyəti də yaxşı bilirdi. Ona görə də tez bir vaxtda öz ağlı və biliyinə, dünyagörüşünün zənginliyinə görə həmkarlarına ciddi təsir edir və onlar arasında böyük hörmət qazanır. Onun siyasi fəallığı daha da güclənir. Tələbə yoldaşları İbrahim Tema, İshaq Sükuti, Abdulla Cövdət və b. ilə birlikdə "İttihad və tərəqqi" partiyasını yaradır. Bu partiyanın məqsədi Türkiyədə müstəbidlik rejimini yıxmaq, ölkədə demokratik bir dövlət və

müasir cəmiyyət qurmaq, eyni zamanda dünyadakı bütün türklərin birliyinə nail olmaqdan ibarət idi.

Ə.Hüseynzadə Türkiyədə çıxan "Ramazan bağçası", "Məlumat" məcmuələrində, Qahirədə nəşr olunan "Türk" qəzetində bədii tərcümələrini, orijinal əsərlərini, məqalələrini dərc etdirir.

İllər keçdikcə "İttihad və tərəqqi" partiyasının fəaliyyəti sultan xəfiyyələrinin diqqətini cəlb edir və gizli şəkildə siyasətlə məşğul olmaq xeyli çətinləşir. Elə bir vəziyyət yaranır ki, Əlibəy daha Türkiyədə qala bilmir. Dostlarından biri ona xəbərdarlıq edir ki, bir azdan sultan xəfiyyələri ittihadçıları həbs etdirib gecə ikən Bosfora atdıracaqdır. Bu sözləri deyən şəxs Əlibəyin tanışı - Hindistana qənd aparan bir tacir idi. Əlibəy paltarını dəyişib sahilə gələrək səhərə kimi qənd çəlləklərinin birində gizlənir və sübh tezdən Hindistana yola düşürlər. Bir müddət Hindistanda qalan Əlibəy oradan İrana keçir və buradan da vətəninə - Azərbaycana qayıdır.

O, 1904-cü ildən Bakıda Səadət mədrəsəsində müəllimlik və müdirlik edir. Az vaxtda Ə.Hüseynzadə şəhərin mədəni və ictimai həyatının aparıcı şəxsiyyətlərindən birinə çevrilir. H.Z.Tağıyev ziyalıları birləşdirən milli qəzetə ehtiyacı nəzərə alaraq imperator həzrətlərinə müraciət edib qəzet çıxarmağa icazə istəyir. İcazə alındıqdan sonra 1905-ci ilin iyunundan etibarən Bakıda "Həyat" adlı qəzet fəaliyyətə başlayır. Qəzeti əvvəlcə Əlimərdan bəy Topçubaşov (müdir), Əlibəy Hüseynzadə və Əhmədbəy Ağayev (redaktorlar) birlikdə çıxarırdılar, lakin bir qədər keçdikdən sonra Əlimərdan bəy Duma məclisinə seçildiyindən, Əhmədbəy isə ayrılaraq "İrşad" adlı qəzet çıxarmağa başladığından "Həyat"a təklikdə Ə.Hüseynzadə rəhbərlik edirdi.

Xalqın milli şüurunu oyatmaq uğrunda "Həyat"ın apardığı böyük iş çar senzurasının və erməni xəfiyyələrinin nəzarətindən qaçmır. Ona görə də nəşr olunduğu ilk gündən qəzeti təqib edirdilər. Bu səbəbdən də 1906-cı il sentyabrın 3-də "Həyat" qəzeti "zərərli istiqamətlərinə görə" dayandırılır. Aradan az müddət keçmiş Ə.Hüseynzadə daha ciddi bir orqan - "Füyuzat" adlı həftəlik jurnal nəşr etməyə başlayır.

1906-cı il noyabrın 1-dən nəşrə başlayan "Füyuzat" "Həyat"ın işini davam etdirir, milli düşüncəli ziyalıları, ədibləri öz ətrafında birləşdirirdi. "Füyuzat"ın tutduğu yol türkçülük, müsəlmançılıq və avropalaşmaq yolu idi.

"Füyuzat"ın da nəşri uzun çəkmir, az keçmiş o da bağlanır. Əlibəy bir neçə il Səadət məktəbində işləyir və həmin illərdə "İrşad", "Tərəqqi", "Həqiqət" kimi qəzetlərdə məqalələrlə çıxış edir. Onun "Siyasəti-fürusət" /At oynatmaq siyasəti/ əsəri həmin illərin məhsuludur.

1905-1907-ci illər rus inqilabından sonra irtica getdikcə güclənir və mütərəqqi fikirli adamların, milli düşüncəli xadimlərin təqibləri başlayır. Vəziyyəti belə görən Əlibəy - 1910-cu ildə yenidən Türkiyəyə mühacirət etməyə məcbur olur.

Ə.Hüseynzadə Türkiyədə İstanbul universitetinin tibb fakültəsində professor vəzifəsində çalışır, eyni zamanda elmi, ədəbi, siyasi fəaliyyətini davam etdirir. O, 1912-ci ildə ailə qurmuş, əvvəlcə qızı, 1914-cü ildə isə oğlu dünyaya gəlmişdir.

Əlibəy Hüseynzadə Türkiyədə Ə.Ağayev, Z.Göyalp, Y.Akçura oğlu, M.Rəsulzadə və b. ilə birlikdə "Türk ocağı" dərnəyini təşkil edir, dövri mətbuatda şeirlərini, məqalələrini, tərcümələrini dərc etdirir, tibbə dair əsərlər yazır. Birinci dünya müharibəsi zamanı "Turan heyəti" adında bir qrupun tərkibində Avropaya - Stokholma gedir. O, Avropada türkçülüyü təbliğ etməklə yanaşı, türk xalqlarının hüquqlarını müdafiə edir. Mustafa Kamal Atatürkün hökumətində bir sıra

vəzifələrdə işləyir.

1926-cı ildə Bakıda keçirilən türkoloji qurultaya dəvət olunur, orada məruzə ilə çıxış edir. Onun məruzəsi yüksək qiymətləndirilir.

1933-cü ilə qədər İstanbul universitetində işləyən Əlibəy ömrünün son illərində ədəbi yaradıcılıq və tərcüməçiliklə məşğul olmuşdur. O, 1940-cı il martın 17-də vəfat etmiş və İstanbulun məşhur Qaracaəhməd qəbiristanlığında dəfn olunmuşdur.

Ə.Hüseynzadə Azərbaycanda işlədiyi, fəaliyyət göstərdiyi illərdə xalqımıza öz milli mənsubiyyəti, şanlı tarixi ilə qürur hissi yaratmağa, ədalət və bərabərlik ideyaları aşılamağa çalışırdı.

Böyük türk alimi Z.Göyalp Ə.Hüseynzadənin irəli sürdüyü türkçülük, müsəlmançılıq, müasirlik kimi üçlük düsturunu yüksək qiymətləndirərək deyirdi ki, bu üçlü düstur türk dünyasında yeni üfüqlər açmışdır. Heç kimə sağlığında dahi deyilmədiyi halda, Ə.Hüseynzadəyə dönə-dönə dahi deyə müraciət olunmuşdur. Bu sözü onun haqqında Ə.Qəmküsar, Ü.Hacıbəyli, M.S.Ordubadi və qeyriləri işlətmişlər. Azərbaycan bayrağını mənalandıran üç mühüm amilin yaradıcısı da Ə.Hüseynzadə olmuşdur. Türkçülüyün ilk mütəfəkkiri Əlibəy Hüseynzadəyə türkçülük, islamçılıq və müasirlik Avropa mədəniyyətini bir tezis, antitezis və sintez şəklində prinsip olaraq müəyyənləşdirmək şərəfi nəsib olmuşdur.

Ə.Hüseynzadə “Hali vətən” şerində vətənin halını belə təsvir edirdi:

Ucundadır dilimin,
Həqiqətin böyüyü.
Nə qoydular deyəyim,
Nə kəsdilər dilimi.
Bilirsənmi, çü hala
Nə etdilər Vatana?
Nə qoydular uyuya,
Nə qoydular oyana.

“İnsanlar, insanlar”... adlı fəlsəfi şeirində Ə.Hüseynzadə bəşər tarixinə ekskurs edərək insanların nələr törətmədiyini, nə kimi zülmlər etmədiyini yada salır, insanları azadlığa, bərabərliyə, qan tökməməyə çağırır: “Ölən kim, öldürən kim, zülm edən kim, ağlayan kimdir? Bir az fikir etməyin: Sizdən deyilmi onlar, insanlar? Zülm edən siz, cəllad sizdən, bu halı insan vicdanı necə qəbul edir, insanlar?”

“Bu da, yahu, keçər” adlı şerində isə belə yazırdı:

Zülmət və şər bulsa da bir dəm zəfər,
Pərtəvə hökm etsə də zülmət əgər.
Sansa da ənvari-kamal və hünər,
Qəm yemə, səbr et, bu da, yahu keçər.
Millətə, milliyyətə, hüriyyətə
Aşiq olan uğrasaq da möhnətə
Yari Vətən düşsə də, şər qürbətə,
Qəm yemə, səbr et, bu da, yahu keçər.

Ə.Hüseynzadə Şərqin islam aləminin elmin inkişafındakı xidmətinə yüksək qiymət verərək deyirdi ki, aləmi-islamın: türkün, ərəbin, farsın çoxlu, istənilən qədər alimləri, həkimləri, ədibləri, şairləri, qəhrəmanları, dahiləri vardır. Lakin əmin olmalıdır ki, zülməti-cəhalət üzündən biz onların mənəviyyati-asarinə vaqif olmadığımız halda, avropalılar əllərindəki şöleyi-maarif sahəsindəki bu asardan bizdən ziyadə istifadə edirdilər.

İndi bizə deyirlər ki, madam ki, ingilislər, firənglər, filanlar böylə imişlər, nə üçün “Füyuzat”ınızda onlara müraciət edirsiniz? Ortaya gah Hötenin “Faust”unu, gah Şekspirin “Yuli Sezar”ını, gah nəbilim hankı avropalının hankı əsərini ortaya çıxarırsınız? Avropalaşaq, firəngləşək deyirsiniz? Lakin ey oxucu, müraciətdən müraciətə fərq var; biz avropalaşanların özlərinə deyil, onların ədəbiyyatlarına, sənayelərinə, elm və maariflərinə, nəşriyyat və ixtiralarına müraciət etmək istəyirik. Biz istəyirik ki, islam ölkəsinə onların beyinləri, ağılları girsin, boğazları, mədələri girməsin. Biz istəyirik ki, öl-

kəmiz onların beyinlərini həzm etsin, yoxsa mədələrində həzm olunmasın. Bu gün onların mədələrində həzm olunmamaq üçün bir çarə varsa, o da onların beyin məhsullarını alıb həzm etməkdən başqa bir şey deyildir.

Ə.Hüseynzadə onu da qeyd edirdi ki, türkdə, türklərdə, türk qövmünün fitrətində bir sıra əsəri-düha, bir fövqəladə istedad vardır, meydan, müsaid, məkan və zaman müvafiq olduqca, o, istedad, elm və hünər aləmində xarüqələr yaradar. O düha cahangirlik asimanında yıldırımlar kimi bərq vurar, Teymurlənglər kimi atəşpərələr hədiyyə edər, o, atəş zəkayi elm və fənn çəmənlərində şükufələr, meyvələr təhvil edər, Uluqbəy kimi böyük şəxsiyyətlər yetişdirər, o, şevqi-məali hikmət və fəlsəfə bəhrində mövzan imaq olur, sahili-bəşəriyyətə Fərabi kimi dürdanələr atar, o, ətri-tülyat evci bəlayi mənaya doğru savad edib oradan Mollayi Rumi, Əlişir Nəvai, Füzuli, Kəmal, Hamid şəklində təcəssüm eylər, meydani-süxənnə əbrineysan kimi dürərbar və gövhərlər olur.

Ə.Hüseynzadə deyirdi ki, azadlıq zehinləri, fikirləri, xətaları bəşərin bütün ruh və mənəviyyatını ülviyyətə sövq edən qüvvədir. Onun yolunda neçə-neçə dahilər, əzəmətli şəxsiyyətlər məhbəslərdə, qürbətlərdə, Sibir çöllərində hər növ iztirabı, hər növ əzab və cəfanı qəbul etmişlər. O, nə qüvvədir ki, onun zühuru, bəşəriyyətin ona nailiyyəti bu mənəvi əzablara, zəlzələlərə bais olub məmləkəti sərasər bir mübarizə meydanına çevirdi... Yaşa azadlıq! Onun fikrincə, qaranlıq elə bir şeydir ki, onun hökmfərman olduğu məkanlarda və zamanlarda insan nə özünü, nə də əynindəki paltarına, nə də yerin daxili və xaricini verə bilmir. Bunları görmək, istifadə edə bilmək ancaq işıq sayəsində ola bilər. Mənəvi zülmətlə mənəvi ziya da bunlar kimidir. Deməli, millətə elm, maarif, təhsil lazımdır. Bunu isə məktəblə, müəllimlə əldə etmək olar.

Ə.Hüseynzadənin ədəbi-elmi irsi bu gün də bu əmələ xidmət edir və öz əhəmiyyətini itirmir.

**İstifadə edilmiş ədəbiyyat**


1. Hüseynzadə Ə. Seçilmiş əsərləri. Bakı: Çaşıoğlu, 2007.
2. Məmmədov X. Ə.Hüseynzadə və "Molla Nəsrəddin". // Ədəbiyyat qəzeti, 1991, 3 may.
3. Azər Turan. Əlibəy Hüseynzadə. Moskva: Salam press, 2008.
4. Bayramlı O. Türkləşmək, islamlaşmaq və Avropalaşmaq. // "Respublika" qəzeti, 15 may, 2002.
5. Böyük maarifçi, türkçülüyün atası. // Azərbaycan məktəbi, 2010, № 5.


**С.Кулиев,**
**М.Кулиева**

**Об истории пропоганды просвешенческих и тюркских идей**
**Резюме**

Алибеку Гусейнзаде, как первому мыслителю-тюркисту, выпала честь определить принципы тюркизма, ислама и современной европейской культуры в виде тезиса, антитезиса и синтеза.

**S.Guliyev,**
**M.Guliyeva**

**From the history of enlightenment and turkism ideas**

**Summary**

Ali beck Husseinzadeh played great role in awakening national consciousness of the people. He, as a first thinker-Turkism did his best to define principles of Turkism, Islam and modern European culture in the form of the thesis, antithesis and synthesis.

# SƏNƏTİN HƏQİQƏTLƏRİ YOLUNDA

**Təyyar Salamoğlu**
***filologiya üzrə elmlər doktoru, professor***

***Açar sözlər:*** *ədəbiyyat, ədəbi tənqid, yaradıcılıq, nəsr, tendensiya.*
***Ключевая слова:*** *литература, литературная критика, творчество, проза, тенденция.*
***Key word:*** *literature, literary critic, literary activity, prose, tendency.*

Hamı onu Məmmədcəfər müəllim kimi tanıyırdı. O özü isə, məktəbə, müəllimə sıx tellərlə bağlı idi. O tez-tez ona orta məktəbdə dərs demiş müəllimlərin, o cümlədən Naxçıvan əməkdar məktəb müəllimi Nazlı xanım Tahirovanın adını çəkərdi. Maraqlı, mürəkkəb bir həyat yolu keçmiş Nazlı xanımın uğursuz taleyinə də acıyırdı. Onun ədəbiyyata həvəsi də elə həmin vaxtdan başlamışdır. Müəllim kimi, yaradıcı şəxs kimi böyük nüfuza malik olması onu tələbələrinə daha çox sevdirirdi. Müasirləri arasında onun görkəmli ədəbiyyat tarixçəsi kimi qəbul edilməsi bir müəllim kimi də onun nüfuzunu artırırdı. Hər yerdə ona hörmətlə yanaşırdılar. O əsl mənada müəllim idi. Tələbələrinə dərin bilik vermək onun idealı idi. Müasirləri təsdiq edir ki, M.C.Cəfərov çox görkəmli ədəbiyyat tarixçisidir. Bu, indi də mübahisə doğurmayan bir həqiqətdir. Lakin o, öz stixiyası etibarı ilə tənqidçidir. Ədəbi tənqid onun yaradıcılığının ana xəttidir. M.C.Cəfərovun ədəbiyyat tarixçisi kimi fəaliyyəti ilə tənqid sahəsindəki fəaliyyəti yaşıddır. 40-cı illərdən 80-ci illərə qədər o, hər iki sahədə paralel və ardıcıl çalışmışdır. Ədəbiyyat tarixi sahəsindəki fəaliyyəti (xüsusən romantizmlə bağlı tədqiqatları) üzərinə qətiyyən kölgə salmadan deyə bilərik ki, o, ədəbi tənqiddə daha nüfuzlu bir mövqeyə, heç kiminkinə bənzəməyən bir üsluba sahibdir.

Lakin burası da var ki, bu nüfuzun qazanılmasında, bu üslubun müəyyənləşməsində onun milli və dünya ədəbiyyatının tarixini dərindən bilməsinin, ədəbiyyat tarixinin ən müxtəlif dövrləri ilə bağlı ardıcıl araşdırmalar aparmasının da çox mühüm rolu var.

“Ədəbi düşüncələr” (Bakı: Azərnəşr, 1958), “Həyatın romantikası” (Bakı: Azərnəşr, 1968), “Sənət yollarında” (Bakı: Gənclik, 1975), “Həmişə bizimlə” (Bakı: Yazıçı, 1980) kitabları və sonrakı illərdə 1940-1990-cı illər arasında M.C.Cəfərovun ədəbi tənqid sahəsindəki aramsız fəaliyyətinin məhsulları olaraq ərsəyə gəlmişdir.

Tənqidə gəldiyi ilk illərdən başlayaraq M.C.Cəfərov çağdaş ədəbi prosesin ən müxtəlif problemlərinə və istiqamətlərinə nüfuz etməkdən çəkinməmişdir. Onun tənqidi düşüncəsindəki universallıq bu sahədə fəaliyyət göstərdiyi ilk onillikdən özünü büruzə vermişdir.

Bu mənada bədii nəsr problemlərinə, xüsusən 50-60-cı illərin nəsrinə tənqidçinin yanaşmaları orijinallığı və obyektivliyi ilə diqqətəlayiqdir. Bu illərdə bədii nəsrin təhlilinə daha ciddi ehtiyac duyulurdu. Məlumdur ki, 50-ci illərin ədəbi prosesində gənc nasir kimi İ.Hüseynovun əsərləri diqqəti çəkirdi. İlk hekayələri, “Bizim qızlar”, “Dan ulduzu” kimi povestləri ilə o, ədəbi tənqidin marağına səbəb olmuşdu. Bəlkə də bu illərdə və sonrakı onillikdə də gənc nasir

olaraq İ.Hüseynov qədər eyni zamanda həm tənqid olunan, həm də təqdir olunan yazıçı olmamışdır.

M.C.Cəfərov böyük sənət duyumu, həssas tənqidçi təfəkkürü ilə İ.Hüseynovun Azərbaycan nəsrinə sıradan bir nasir kimi gəlmədiyini ən tez başa düşən və qəbul edən tənqidçilərdən biridir. "Dan ulduzu" (1954), "Doğma və yad adamlar" (1959) məqalələrində M.C.Cəfərovun İ.Hüseynovun yazıçı istedadına dərin inamı duyulur, onun istedadına inandığı gənc nasiri tənqidçi qələminin bütün gücü ilə böyük sənət yoluna çıxarmaq üçün əlindən gələni etməyə hazır olduğu aşkar görünür. Bu məqalələrdə yazıçının "Bizim qızlar", "Dan ulduzu" və "Doğma və yad adamlar" povestləri təfərrüatlı təhlilə çəkilir.

İ.Hüseynovda, ilk növbədə, tənqidçinin diqqətini çəkən, marağına səbəb olan "onun yaradıcılıq istedadının orijinal xüsusiyyətləri"dir, "sözün həqiqi mənasında obrazlı təfəkkürə malik" olmasıdır. İ.Hüseynovda "hər bir hadisənin mahiyyətinə dərindən nüfuz edə bilən çox incə yazıçılıq müşahidəsinin" görünməsi, "yazıçının canlı dili çox gözəl" bilməsi, "ədəbi dilin bütün qanunlarına riayət etməklə, bu dildən son dərəcə səmərəli istifadə etməyi bacarması" M.C.Cəfərovu təmin edir, həqiqi bir sənətkar olmaq üçün bu cəhətlərin çox vacib keyfiyyətlər olduğunu başa düşən tənqidçi yazıçının yaradıcılığında özünü göstərən qüsurların zaman-zaman, xüsusən tənqid onun yaradıcılığına həssas yanaşıb düzgün istiqamətləndirəcəyi təqdirdə, yazıçının da bu tənqidə həssas yanaşacağı təqdirdə düzələcəyinə inanırdı.

Görkəmli alim "Dan ulduzu" povesti haqqında yazırdı: "Mövzu çox əhəmiyyətli və müasirdir, məqsəd çox gözəl və aydındır. Müəllif bundan əvvəl yazdığı "Bizim qızlar" povestində də qarşısına bu cür məqsəd qoymuşdu. Bu povestdə də kolxozçu gənclərin yeni, mədəni baramaçılıq uğrunda mübarizəsi təsvir olunurdu". Tənqidçinin "Bizim qızlar" və "Dan ulduzu" povestlərinin mövzusunu təqdir etməsi zamanın ədəbiyyat siyasətinin ifadəsidir, mövzunun "əhəmiyyətli və müasir" olması haqqında fikirlər zamanın "həqiqətləri"ni əks etdirir. Ancaq mövzuya müsbət münasibətdə M.C.Cəfərovun təqdir etdiyi başqa həqiqət də var: "Mövzunun xarakteri göstərir ki, burada yazıçı yalnız təsərrüfat hadisələrini və yeniliklərini təsvir etməklə kifayətlənə bilməz. Əsas vəzifə şüurla, mənəviyyatla, bir sözlə, insanla məşğul olmaqdır. "Dan ulduzu" müəllifi də qarşısına belə bir məqsəd qoymuşdur". Bu, artıq bədii mətnə yanaşmada zamanın "həqiqəti"nin yox, sənət həqiqətinin önə çəkilməsidir, sosiolojidən estetikliyə keçidi şərtləndirir. M.C.Cəfərovun İ.Hüseynovun ilk povestlərinin mövzusu ilə bağlı təqdir etdiyi iki cəhəti - əslində bir-birini rədd edən iki cəhəti ortaq məxrəcə gətirmək cəhdi əsərlərin qələmə alındığı zamanın sənətə münasibətdə keçid xarakterli olmasını, dualist münasibətin də buradan irəli gəldiyini işarələyir. 50-ci illərin əvvəllərinin yazıçısı kimi İ.Hüseynov da, 50-ci illərin tənqidçisi kimi M.C.Cəfərov da eyni zamanda sənətdə istehsalat problemlərinin baş məqsədə çevrilməsinin effektsizliyini duymuş, istehsalat problemləri fonunda insan mənəviyyatını önə çəkməyin zəruriliyini başa düşmüşlər. İ.Hüseynov başa düşdüyünə, dərk etdiyinə təcrübəsinin azlığı üzündən mükəmməl bədii həll verməyə çətinlik çəkmişdirsə, tənqidçi də əsəri birbaşa insan mənəviyyatı kontekstinə çıxarmağa bir o qədər çətinlik çəkmişdir. Onun "baramaçılıq uğrunda mübarizə"yə "çox əhəmiyyətli və müasir" mövzu kimi yanaşması da bunun əlamətidir.

Alimin Minayə ("Bizim qızlar") və Zərəfşan ("Dan ulduzu") obrazlarında müsbət qəhrəman axtarıcılığının ideoloji əsaslara söykəndiyi şübhə doğurmur. Tənqidçiyə

görə, müəllif əsərində müsbət qəhrəmanın yaranmasına imkan verən “xarakterik həyat hadisələri” seçə bilməmişdir. Yenə də tənqidçiyə görə, “bu hadisələr məhz elə xarakterik həyat hadisələri və bu insanlar, istər mənfi, istər müsbət, elə xarakterik insanlar olmalıdır ki, onların arasında, onlarla münasibətdə yazıçının yaratmaq istədiyi ən səciyyəvi, müsbət xarakter özünü göstərməyə imkan və meydan tapa bilsin”. Sosrealizmin estetik prinsipləri baxımından bu tələb tamam haqlıdır. Lakin bir məsələ var. Ümumiyyətlə, fərdi yaradıcılıq manerasını, həyatı bədii idrakda özünəməxsusluğunu elə ilk əsərlərində bu və ya digər dərəcədə göstərməyə nail olan yazıçının “ən səciyyəvi, müsbət xarakter – qəhrəman” yaratmaq fikri olmuşdurmu? Bəlkə, Minayə, yaxud Zərəfşan İ.Hüseynovun realist qələmində daha çox adi insan, həyati obraz kimi düşünülmüşdür?

Məsələ burasındadır ki, istər Zərəfşan obrazı, istərsə də Nadir və Kərim dayı obrazları ilə bağlı təsvir edilən hadisələrin həyati situasiyalardan doğduğunu, həyat həqiqətinin ifadəsi olduğunu tənqidçi özü də etiraf edir: “Bu təsvirlərin (Zərəfşanla bağlı təsvirlərin - T.S.) qeyri-təbii olduğuna hökm vermək sadəlövhlük olardı... Qoca Kərim dayının bu qayğıkeşliyi də həyat həqiqətidir. Çox təbii və inandırıcıdır. Bu qayğıkeşlik sənətin güzgüsünə düşməyə layiqdir. Üstəlik burada hər tipi öz dili ilə danışdırmaqda müəllifin ustalığını da qeyd etmək olar”.

Tənqidçiyə görə, yazıçı Zərəfşanı “sənətin böyük tələblərinə görə” canlandıra bilməmişdir. Yaxşı, axı yazıçı bir insan (tənqidçiyə görə - yeni insan) kimi qəhrəmanını görüb, duya bilmişdirsə, Zərəfşanla, eləcə də digər qəhrəmanlarla bağlı təsvirlər həyat həqiqətinin ifadəsi kimi təbii və inandırıcıdırsa, onda tənqidçi nədən narazıdır? Və o “sənətin böyük tələbləri” dedikdə nəyə nəzərdə tutur? Tənqidçinin təhlillərindən görünür ki, Zərəfşan tənqidçinin “müsbət qəhrəman” tələblərinə cavab vermir. Tənqidçi Zərəfşanda “köhnəliklə üz-üzə gələn yeniliyin, xüsusən kəndin yeni gənc qüvvələrinin” ümumiləşdirilmiş obrazını görmək istəyir. Tənqidçi hər iki povestin əsas qəhrəmanlarını - Minayəni və Zərəfşanı müqayisə edir və belə qərara gəlir ki, “...Zərəfşan bir müsbət surət kimi Minayəyə nisbətən zəifdir”. Şübhəsiz ki, tənqidçi bu cəhəti gənc yazıçının yaradıcılığında geriyə doğru addım, ümumən isə sənətkarlıq qüsuru hesab edir. Diqqət edilsə, Minayə və Zərəfşan obrazları və ümumiyyətlə, İ.Hüseynovun bu povestləri ilə bağlı deyilən qüsurların demək olar ki, hamısı “müsbət qəhrəman” məsələsi ilə bağlıdır. Sosrealizmin “müsbət qəhrəman” parametrləri ilə yanaşanda M.C.Cəfərovun Zərəfşanı Minayəyə nisbətən zəif hesab etməsi tamamilə qanunauyğun görünür. Ancaq bədii yaradıcılığa gəldiyi ilk əsərlərindən etibarən yazıçının əsərdən əsərə öz prinsiplərini daha inadla sənətə tətbiq etdiyini də düşünmək olar. Məsələn, düşünmək olar ki, “Bizim qızlar”da “Dan ulduzu”na nisbətən yazıçı daha çox sosrealizm prinsiplərindən çıxış edirdi və yaxud əksinə, “Dan ulduzu”nda o, daha artıq sərbəstlik nümayiş etdirə bilmiş, öz aparıcı qəhrəmanını bu metodun prinsiplərinə tabe tutmağa o qədər meyil etməmişdir. Əslində bu proses şüurlu yaradıcılıq addımı kimi yox, bədii istedadın realist qələmə təlqinləri şəklində olaraq baş vermişdir. Öz estetik təfəkkür tərzi ilə həyatiliyə meyilli olan yazıçı qəhrəmanını ideolojinin reseptləri əsasında yox, gördüyü, müşahidə etdiyi həyati situasiyalar, canlı insanlar üzərindəki müşahidələri əsasında yaratmışdır. Bu mənada, heç şübhəsiz ki, “Bizim qızlar”a nisbətən “Dan ulduzu”, Minayəyə nisbətən Zərəfşanı bədii nəsrimizdə, eləcə də İ.Hüseynovun yaradıcılığında irəliyə doğru hərəkətin nəticəsi saymaq mümkündür.

Müşahidə edirik ki, İ.Hüseynovun yaradıcılıq təcrübəsi artdıqca, o, yeni-yeni əsərlər yazdıqca ədəbi tənqidin daha sərt reaksiyaları ilə üzləşir. Yazıçı "Bizim qızlar"a nisbətən "Dan ulduzu", "Dan ulduzu"na nisbətən "Doğma və yad adamlar"la bağlı daha ciddi tənqidlə qarşılaşır. Tənqid və yazıçı münasibətlərində paradoksallıq artmağa başlayır və yazıçının həyat hadisələrinə münasibətinin xarakteri tənqidin aktiv etirazına səbəb olur. "Doğma və yad adamlar" povestini oxuyandan sonra M.C. Cəfərov yazırdı: "Sizə nə olmuşdur? Əvvəlki əsərlərinizdə geniş həyat üfüqləri, zəhmət, fəaliyyət, mübarizə meydanı var idi. Burada isə nəinki qəhrəmanlarınız, heç oxucu xəyalı da tərpənməyə yer tapa bilmir". Tənqidin mövqeyini qəbul etsək, düşünməliyik ki, İ.Hüseynov əsərdən əsərə geri gedir. Çünki "Yanar ürək" romanı da müəyyən mənada, belə də deyə bilərik ki, tənqidin "əsəblərini" tamam tarıma çəkmiş, yazıçı həyat həqiqətini təhrifdə suçlanmışdı. M.C.Cəfərov yazırdı: "Bizim arzumuz budur ki, bundan əvvəl yazdığınız əsərlərdə olduğu kimi həyat adamları necə tərbiyə edirsə, siz də onu olduğu kimi göstərməyə çalışasınız". Tənqid bu mövqeyində haqlı idimi? Axı deyirlər, zaman ən yaxşı tənqidçidir. Müasir ədəbiyyatşünaslıqda "Bizim qızlar" və "Dan ulduzu"na nisbətən "Doğma və yad adamlar"da, sonuncu ilə müqayisədə "Yanar ürək", "Tütək səsi", "Teleqram"da yazıçının yeni yaradıcılıq üfüqlərinə çıxması, nəsrimizdə "insan amilini, şəxsiyyət başlanğıcı"nı önə çəkən, əsaslandıran psixoloji nəsrin ən uğurlu nümunələrini yaratması birmənalı şəkildə qəbul olunmuşdur. Onda bəs nə üçün tənqidçi, hətta 1965-ci ildə, ədəbiyyatımızın və eləcə də tənqidimizin yeni keyfiyyət mərhələsinə daxil olduğu illərdə belə "Doğma və yad adamlar"ı, "Tütək səsi"ni varlığa subyektiv münasibətdə suçlayır, "Teleqram"ı kəndi birtərəfli, tüfeyliliyi "ilk planda təsvir" edən, "yeknəsəq bədii priyom"la, "süni süjet quruluşu"nda yazılmış əsərlərdən sayır?

"Doğma və yad adamlar" povestinə həsr edilmiş məqalədə biz bu suala əhatəli cavab tapırıq. Məlum olur ki, həyat həqiqətinin bədii həqiqətə çevrilməsi məsələsində yazıçı ilə tənqidçi arasında hələ sənətkarın ilk əsərlərinə münasibətdə özünü göstərən haçalanma, fikir ayrılığı getdikcə dərinləşir. Bir növ yazıçı tənqidin tövsiyələrini qulaqardına vurur. Özünün bədii inikas prinsiplərinin arxasınca gedir. Tənqidin təlqin etdiyi prinsiplərə yox, özünün dünya duyumuna axıra qədər sadiq qalan yazıçı tənqidçilərin sərt tənqidi ilə üzləşir.

Ümumilikdə Məmməd Cəfər tənqidinin həyat həqiqətinin estetik həqiqət şəklində dərki istiqamətində ciddi bir təkamül yolu keçməsi haqqında fikir söyləməyə əsas verir. "Doğma və yad adamlar", "Əməlpərvər ədib", "Romanlar müəllifi", "Yazıçı-tərbiyəçi", "Mənalı konfliktlər", "General" romanı və müharibə mövzusu", "Müasir kəndin təsviri", "Ədəbiyyatımızın yeni nəsli", "Yüksək sənətkarlıq uğrunda", "Bir mübahisə münasibətilə", "Xalqla bir cəbhədə" məqalələrində bədii nəsrimizin müxtəlif keyfiyyət mərhələləri və nümayəndələrinin yaradıcılığı haqqında əhatəli və dolğun təsəvvür yaradılır. Bu məqalələrdə nəsrin irəliyə doğru hərəkətini fərqli janrların – hekayənin, povest və romanın, həmçinin fərdi üslubların, hətta üslub təmayüllərinin kontekstində izləmək mümkündür.

Məmməd Cəfər tənqidində deyilməsi vacib olan həqiqət, deyilməsi mümkün olan elmi həqiqət şəklində ifadəsini tapıb.

Bu isə o deməkdir ki, bu tənqiddə zamanın "həqiqətləri" ilə sənətin həqiqətləri həmişə üz-üzədir. M.C.Cəfərovun tənqidçi xarakterini səciyyələndirən ən əsas cəhət də ondan ibarətdir ki, bu mübarizə prosesində sənət həqiqəti zamanın "həqiqəti"nə heç

vaxt qurban verilmir. Bəlkə, belə də demək olar ki, zamanın “həqiqətləri”nin dilə gətirilməsi sənətin həqiqətlərini demək üçün vəsilə olur.

Fikrimizin təsdiqi mənasında “Ədəbiyyatımızın yeni nəsli” və “Yüksək sənətkarlıq uğrunda” məqalələrinə daha təfərrüatlı nəzər salaq. 1962-ci ildə yazılmış birinci məqalə aşağıdakı cümlə ilə başlayır: “Ədəbiyyatımızın yeni, üçüncü nəsli yetişir”. Tənqidçi elə bu cümlə ilə həm tədqiqatının obyektini, həm də məramını müəyyənləşdirir: Ədəbiyyata gələn yeni qüvvələrin yaradıcılığı haqqında qənaətlərini əks etdirmək; yeni nəsil yazarların yaradıcılığındakı müsbət tendensiyalara və qüsurlu hallara diqqət çəkmək. Təbii ki, əsas məqsəd ədəbi prosesin inkişafına təkan verməkdir. Bu məqalədə ədəbi proses həm nəsr, həm də poeziyanın hərəkəti istiqamətində izlənir; M.C.Cəfərov Ə.Hacızadə, Y.Səmədoğlu, Anar, A.Əfəndiyev, Ş.Fərzəliyev, Ç.Hüseynov, T.Əfəndiyev, Ə.Hacıyev, Ə.Mirzəcəfərli, Ç.Ələkbərzadə və eləcə də bədii nəsrimizdə imzaları yenicə görünməyə başlayan digər nasirlər haqqında fikir söyləyir. O qədər də böyük olmayan məqalədə yeni nəsil şairlərinin də yaradıcılığının zəngin palitrasının yaradıldığını nəzərə alsaq, tənqidçinin ədəbi prosesə həssas münasibətini, nəsrin və poeziyanın irəliyə doğru hərəkətini ümumiləşdirmək bacarığını xüsusi qeyd etməliyik. Onu da qeyd edək ki, tənqidçi “ümumi sözlər olmasın deyə, gənclərə fərdi yanaşmağı” lazım bilmiş, məhz bu yolla “onların hərəsinin özünəməxsus yaradıcılıq müvəffəqiyyəti və kəsirləri”ni müəyyənləşdirməyi nəzərdə tutmuşdur. İlk diqqəti çəkən cəhət tənqidçinin yeni nəsil sənətkarlarının yaradıcılıq laboratoriyasına yetərincə bələdliyidir. Hələlik daha çox hekayə “orbiti”ndə fırlanan bu gənclərin əsərlərinin fərdi üslub, fərdi yazı manerası kontekstində qiymətləndirilməsi, şübhəsiz ki, tənqidçinin ədəbi prosesə yeni rakursdan, yeni baxış bucağı ilə yanaşmasının əlamətidir. Müəllif güzəştsiz təhlil aparır; Ə.Hacızadə, Anar, Y.Səmədoğlu, Ç.Hüseynov kimi sonradan məşhur Azərbaycan nasirləri kimi tanınan sənətkarların, eləcə də imzasını sonradan təsdiq edə bilməyənlərin yaradıcılığının çox qısa, lakin olduqca elmi xarakteristikasını verir. Bir nasir kimi onların ümid verən cəhətləri ilə yanaşı, gələcəkdə inkişaflarına mane ola biləcək xüsusiyyətlərə də diqqət yetirir. Məsələn Ə.Hacızadənin hekayələrində dilin emosionallığı, yığcamlığı, işlənməmiş mövzular tapmaq bacarığı, obrazların “fikir və hisslərini verməyə xüsusi səy” göstərilməsini dəqiq müşahidə edib ümumiləşdirən tənqidçi onun bəzi hekayələrində, xüsusən “Ağ saçlı qızın hekayəsi”ndə yazıçının ifrat sentimentalizmə qapılmasına, həm təsvir üsulunun məhdudluğu, həm də təsvir edilən hadisələrin qeyri-təbiiliyi, inandırıcı olmaması, qəhrəmanların, xüsusən ona xəyanət etmiş nişanlısının yolunu on yeddi il gözləyən qızın xarakterinin qeyri-səciyyəviliyinə dair tənqidi mülahizələr söyləyir.

Şübhəsiz ki, yazıçının yaradıcılıq yoluna qiymət vermək kifayət qədər çətin, həm də məsuliyyətli bir işdir. Bu çətinlik də, məsuliyyət də oradan irəli gəlir ki, tənqidçi öz arqumentləri ilə həm yazıçını, həm də oxucunu müşahidə və ümumiləşdirmələrinin dəqiqliyinə inandırmalıdır. Burada uğur qazanmağı, ilk növbədə, tənqidçi istedadı müəyyənləşdirir. İkinci halda isə, sənətkarın yaradıcılıq yolunun hər bir faktına yetərincə bələd olmaq əsas şərtlərdəndir.

M.C.Cəfərovun “Yüksək sənətkarlıq uğrunda” məqaləsi 1965-ci ildə yazılmışdır. Ədəbi icmalın mükəmməl nümunəsi olan bu məqalədə tənqidçi son illər bədii nəsrimizlə bağlı müşahidə və qənaətlərini ümumiləşdirməyi əsas məqsəd kimi götürmüş və “Ədəbiyyatımızın yeni nəsli”ndən fərqli olaraq, burada nəsrimizin inkişafını mövzu və prob-

lematika kontekstində izləməyi nəzərdə tutmuşdur. Məqalədə 60-cı illərdə Azərbaycan nəsrində kolxoz kəndi, fəhlə həyatı, Böyük Vətən müharibəsi, inqilab uğrunda mübarizə, ailə-məişət, mənəvi-əxlaqi problemlər, tarixi və s. mövzularda yazılmış hekayə, povest və romanlar təhlil süzgəcindən keçirilmişdir.

M.C.Cəfərov müasir bədii nəsrin klassik milli nəsr ənənələri əsasında inkişaf etməli olduğunu söyləyəndə, heç şübhəsiz ki, haqlıdır. Milli ənənədən kənarda novatorluq yoxdur. Lakin milli ənənəyə istinad dünya nəsr təcrübəsinə istinadı, dünya nəsrində gedən prosesləri mənimsəyib milli nəsrə tətbiq etməyi inkar etmir. Nəsrin axtarışlarında bu proses qaçılmazdır. Tənqidçi bədii nəsrdə rəmzi-sözaltı mənaya artan meyili realizmdən uzaqlaşmaq kimi təsəvvür edir və 60-cı illər nəsrində görünməyə başlayan bu tipli təsvir üsullarına tənqidi yanaşır.

Ədəbi icmal janrında yazılmış "Ədəbiyyatımızın yeni nəsli", "Yüksək sənətkarlıq uğrunda" məqalələrində tədqiqat predmetinin tələbinə uyğun olaraq M.C.Cəfərovun müxtəlif ədəbi nəsillərin, xüsusən gənc yazarların yaradıcılığına tələbkar, obyektiv, həssas yanaşma ilə bərabər, estetikliyi birmənalı meyara çevirməsi onun tənqidçi təfəkkürünün 60-cı illərdə artıq sosioloji-ideoloji qiymətləndirməyə müxalif bir düşüncəyə kökləndiyini nümayiş etdirir. Məmməd Cəfər yaradıcılığındakı aparıcı keyfiyyətlər - metodoloji-sağlamlıq, elmi-nəzəri dolğunluq və bütün bunların şərtləndirdiyi estetikliyin ön plana keçməsi "ömrün əsən yellərinə istedad yelkəni ilə sinə gərməyin" (Ç.Aytmatov) nəticəsi idi. "Ömrün əsən yellərinə istedad yelkəni ilə sinə gərmək" bacarığı onun tənqidinin həmişəyaşarlığına təminat verən əsas amildir.

*Rəyçi: prof. H.Qasımov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Cəfər M. Estetik tərbiyə: ailə və məktəb. Bakı: Maarif. 1967.
2. Cəfər M. Xatirələr. Bakı, 2010.
3. Qarayev Y. Tarix: yaxından və uzaqdan. Bakı, 1995.

**Т.Саламоглы**

**На пути правды профессии**

**Резюме**

В статье отмечается, что М.Дж. Джафаров выдающийся историк литературы. Автор также заявляет, что литературная критика является главной линией его творчества. Отмечается, что его глубокое знание национальной и мировой литературы помогло ему завоевать важный авторитет критика.

**T.Salamoglu**

**On the pass of truth of education**

**Summary**

In the article it is noted that M.J.Jafarov became a famous literature historian. Literary criticism played great role in his literary activity. The author also spoke about his great achievement as a critic and relates it with his deep knowledge on national and world literature.

# A.O.ÇERNYAYEVSKİ ƏDƏBİYYATDA VƏ XATİRƏLƏRDƏ

**Pəri Paşayeva**
***ADPU-nun dosenti, filologiya fakültəsinin dekan müavini***

***Açar sözlər:*** *pedaqoji fikir, poetik dil, etnoqrafiya, stansiya nəzarətçisi.*
***Ключевая слова:*** *педагогическая мысль, поэтическиц язык, этнография, контролёр станции.*
***Key word:*** *pedagogical thoughts, poetic language, ethnography, station controller.*

XIX əsrin sonu, XX əsrin əvvəllərində Azərbaycan pedaqoji fikrinin inkişafında danılmaz xidmətləri olan A.Bakıxanov, M.Ş. Vazeh, M.F.Axundov, H.B.Zərdabi, S.Ə.Şirvani və başqaları tərəfindən ana dilində məktəb açmaq, proqram və dərsliklər tərtib etmək sahəsində əhəmiyyətli işlər görülmüş, əlifba, ədəbi dil, ana dili, termin, orfoqrafiya kimi məsələlərə aid elmi, bədii əsərlər yazılmış, şəxsi məktublarda, dövrü mətbuatda bu barədə qiymətli fikirlər söylənmiş, həmin fikirlərin praktik olaraq həyata keçirilməsi uğrunda mübarizə aparılaraq, xalqın maariflənməsi yolunda fədakarlıq göstərilmişdilər.

M.F.Axundov "Əkinçi" qəzetinin 1877-ci il nömrələrinin birində məktəb açmaq məsələsini qaldırmış, ana dilini tədris etməyin yollarına dair proyektlər tərtib etmiş, ziyalıları bu sahəyə ciddi diqqət yetirməyə çağırmışdır. Arxiv materiallarında M.Axundovun Azərbaycan dilinə aid bir dərs kitabı tərtib etdiyi də xəbər verilir. Əlifba kimi yazılan bu vəsait, təəssüf ki, bu gün olduğu kimi əlimizdə yoxdur. Bu səbəbdən A.O.Çernyayevskinin tərtib etdiyi "Vətən dili" kitabı Azərbaycanda ilk "Əlifba" dərsliyi kimi qəbul olunur və pedaqoji fikir tariximizdə lazımınca dəyərləndirilir.

Qeyd etmək lazımdır ki, A.O.Çernyayevskinin adı Qori Müəllimlər Seminariyası ilə sıx bağlıdır. Belə ki, M.F.Axundovun böyük səyi və təşəbbüsü ilə 1879-cu ildə Qori Müəllimlər Seminariyasının nəzdində rus, gürcü bölməsi ilə bərabər, Azərbaycan-tatar şöbəsi də açılır və A.O.Çernyayevski həmin şöbəyə müdir təyin olunur. Azərbaycan xalqının savadlanması yolunda çalışan adamlardan biri kimi A.O.Çernyayevski bu vəzifədə çox iş görür, o Azərbaycanı kənd-bəkənd gəzərək, az-çox qabiliyyəti olan türk uşaqlarını həmin seminariyaya cəlb edir, onların maariflənməsinə səylə çalışır. Əlbəttə, bu zaman gələcəkdə ibtidai sinif müəllimləri olacaq seminariya tələbələri üçün "Əlifba" dərsliyi tərtib etmək kimi mühüm bir vəzifə də qarşıda dururdu. O, bu işin də öhdəsindən gəldi və 1882-ci ildə sövti-üsulla "Vətən dili" adlı ilk "Əlifba" dərsliyini yazdı.

1888-ci ildə isə öz tələbəsi olmuş Ş.Vəlibəyovla birlikdə Tiflisdə "Vətən dili" kitabının"Qiraət və oxu" adlanan II hissəsini çap etdirdi. Kitabın giriş hissəsində qrammatika, orfoqrafiya və s. aid bir sıra metodik məsələlər izah edilir, Azərbaycan dili müəllimlərinə dəyərli məsləhət və tövsiyələr verilirdi.

Azərbaycan ədəbiyyatında müxtəlif səpkili, o cümlədən həm bədii, həm də elmi əsərlərdə Çernyayevskinin adı çəkilmiş,

ötəri də olsa ondan bəhs edilmişdir. Lakin böyük pedaqoqun ilk dolğun obrazı öz əksini "Dəli Kür"də tapmışdır. Bu da təbiidir. Çünki bu epopeyada İ.Şıxlı böyük bir dövrün salnaməsini vermişdir.

Çernyayevskinin bədii obraz kimi ədəbiyyata gətirilməsi İ.Şıxlıya mənsub olsa da, onun tarixi şəxsiyyət kimi bədii portreti haqqında danışan "Dəli Kür romanının poetik dili" kitabının müəllifinə (Ə.Tanrıverdi) də nəsib olmuşdur. Oxucu Çernyayevskini Uşinskinin mütərəqqi pedaqoji ideyalarının Azərbaycanda ilk davamçılarından biri kimi tanıyır.

Burada Aleksey Osinoviçin mühüm obrazı onun öz dili ilə yaradılmışdır: "Müəllim üçün tələbəsini boya-başa çatdırmaq ən böyük səadət deyilmi? Məgər müəllim tələbələrini öz balasından azmı sevir?".

"Dəli Kür romanının poetik dili" kitabında Çernyayevski ilə yanaşı onun dilində Şərqin böyük şairi Sədi, qərbin böyük pedaqoqu Pestalotsi də xatırlanır. "Mollaxanada ancaq quran əzbərlədirlər, bir də Sədinin didaktik Gülüstanını öyrədirlər. Əgər belə olmasaydı, Pestalotsi xəstə tələbələrini buraxıb öz oğlunun dəfninə getməzdimi?". Maarifçilik ideyalarının carçısı olan Çernyayevskinin: "Elmli adamlar çox olsa, maarif inkişaf etsə, cəmiyyətdəki ədalətsizlik və haqsızlıq da yox olar", - sözləri oxucunun ürəyindən xəbər verir.

Yenə də "Dəli Kür romanının poetik dili" əsərinə müraciət edək: "Müəllif hər bir obrazı deyil, məhz Çernyayevskinin dili ilə Azərbaycanın coğrafi koordinatlarının bədii mənzərəsini yaradır, İrəvan, Naxçıvan, Şuşa, Şəki, Gəncə, Dərbənd, Qazax kimi şəhərlərimizin bədii obrazını canlandırır".

İ.Şıxlı Çernyayevskinin bədii portretini sənətkarlıqla yaradaraq, onun dərsliyində verilmiş parçaların sadəliyini qeyd edir və Azərbaycan dilini qəlizləşdirib ərəb, fars sözləri ilə dolduran alimləri tənqid edir və "Vətən dili" dərsliyinə üstünlük verərək, müəllifin Azərbaycan dilinin orfoqrafik, qrammatik və metodik məsələlərini izah etmək məqsədilə müəllimlərə qiymətli məsləhət və tövsiyələr verən Çernyayevskinin pedaqoji ustalığını ön plana çəkir. Çernyayevskinin əsl simasını aça bilən İ.Şıxlı onun Azərbaycan dilinə dərindən bələd olduğunu, bu dili sevdiyini də bədii boyalarla, həm də inandırıcı vermişdir.

Maraqlıdır ki, ədəbiyyatımızın şah əsərlərindən biri olan "Dəli Kür" romanında, eləcə də prof. Ə.Tanrıverdinin "Dəli Kür romanının poetik dili" əsərində bütün bu hadisələrin başvermə tarixi çox dəqiq göstərilmişdir. Həm də burada Aleksey Osinoviçin bir pedaqoq kimi bütöv xarakteri açılmışdır.

"Azərbaycan pedaqoji antologiyasında (XIX əsr – XX əsrin əvvəlləri)" (tərtib edən akad. H.Əhmədovdur) A.O.Çernyayevskinin tərcümeyi halı və fəaliyyəti ətraflı verilmişdir. Bu barədə müxtəlif tədqiqatlar aparılsa da, məqalələr yazılsa da səhih məlumat əldə etmək həmişə çətinlik törətmişdir. Antologiyada deyildiyi kimi, A.O.Çernyayevski (1840–1894) Şamaxıda doğulmuş, ilk təhsilini Şamaxı qəza məktəbində almışdır. O, əvvəlcə Mərəzə kəndində poçtalyon, sonra stansiya nəzarətçisi vəzifəsində işləmişdir. Onun səyi ilə 1866-cı ildə Mərəzə kəndində ilk xalq məktəbi təsis edilir və müəllimlik vəzifəsini pulsuz olaraq Çernyayevski öhdəsinə götürür. Yeri gəlmişkən qeyd etməyi lazım bilərəm ki, A.O. Çernyayevskinin pedaqoji görüşləri və fəaliyyətinə dair mərhum akademik M.Mehdizadənin qızı Zemfira Mehdizadə Tiflis arxivlərini araşdıraraq, çox dəyərli namizədlik dissertasiyası yazmışdır. Dövrü mətbuatda da Çernyayevski haqqında az yazılmamışdır. Onun ilk müəllimlik fəaliyyətinə dair hələ 1969-cu ildə Mərəzə qəsəbə orta məktəbində müəllimi işləmiş dos. Nəcəf Nəcəfov toplanmış xatirələr əsasında "Бакинский рабочий"

qəzetində məqalə dərc etdirmişdir. Ötən əsrin 60-cı illərində Mərəzədə hələ Çernyayevski haqqında danışanlar vardı.

Bu gün əlimizdə olan materiallara əsasən deyə bilərik ki, xüsusi təhsili olmamasına baxmayaraq, Çernyayevski bu məktəbdə təhsil işini çox yaxşı səviyyədə qurur, başqa məktəblərdə oğlanlar və qızlar ayrı-ayrı oxuduqları halda, onun məktəbində bunlar bir yerdə oxuyurdular. Bunu ötən əsrin 60-cı illərində Mərəzə qəsəbəsində Çernyayevskinin dərs dediyi qocalar da etiraf edirdi. Akad. H.Əhmədovun tərtib etdiyi “Azərbaycan pedaqoji antologiyası”nda deyilir: “Mərəzə kənd məktəbi hansı cəhətlərilə fərqlənirdi? O hər şeydən əvvəl, A.O.Çernyayevskinin pedaqoji işə həvəsi, təmənnasız və ürəkdən çalışması ilə, Mərəzə məktəbinin şöhrətlənməsi, orada təhsilin pulsuz və kütləvi olması ilə, onun müəllimi Çernyayevskinin xalq kütləsinə yaxınlığı ilə. Dövlət məktəblərindən fərqli olaraq burada kəndli uşaqları oxuyurdu. Məktəbdə fiziki cəza yox idi. Dünyəvi fənlər tədris olunurdu. Təhsildə əsas yeri mexaniki əzbərləmə deyil, şüurlu mənimsəmə tuturdu”.

Böyük zəhmət nəticəsində ümumiləşdirilən bu fikirlər xalq arasındakı xatirələrdə də olduğu kimi yaşayır. Yerli sakinlər Çernyayevskinin məktəb üçün xüsusi bina tikdirməsini, orada kitabxana təşkil etməsini və tezliklə şagirdlərin sayının artmasını, hətta cəmi bir il sonra 67-yə çatmasını minnətdarlıqla xatırlayırlar. Onlar özlərini Çernyayevskinin xələfləri hesab edirlər.

A.O.Çernyayevskinin xalq kütləsinə yaxınlığı, təhsilin pulsuz və kütləvi olması, məktəbdə cismani cəzanın olmaması, təlimin əyanilik prinsipinə əsaslanması onun məktəbinin şöhrətini artırırdı... və bu günədək də yaddaşlardan silinmir.

Yaxşı haldır ki, tədqiqatçılar öz yazıları ilə bu sahəyə bir qədər aydınlıq gətirmişlər. Prof. Ə.Tanrıverdinin “Dəli Kür romanının poetik dili” kitabında yazıldığı kimi “Çernyayevski nəinki Azərbaycan dilini bilir, hətta Azərbaycan etnoqrafiyasına yaxından bələd idi”. Əlbəttə, uzun müddət azərbaycanlıların içində yaşayan, əvvəldə qeyd etdiyimiz kimi, xalq kütləsinə yaxın olan Çernyayevski onun dilinə, etnoqrafiyasına biganə qala bilməzdi.

Çernyayevski doğulduğu Şamaxını, adamlarını özünə o qədər yaxın, o qədər doğma bilirdi ki, istər Şamaxı, istər onun yazıçı və şairləri haqqında doğma, məhrəm sözləri dönə-dönə işlətməkdən yorulmur: “Bizim Şamaxıda S.Ə.Şirvani adlı bir şair var. O, çox güclü və gözüaçıq adamdır” və s.

Çernyayevskinin dili ilə Azərbaycanın coğrafi mənzərəsini göstərərək şəhərlərimizin vəziyyətinə işarə edən “Dəli Kür” müəllifi böyük pedaqoqun daxili həyəcanlarının səbəblərini də göstərirdi. “Cəmi otuz şagird seçə bilmişəm, Naxçıvandan üç nəfər gələcək. Şuşa rus-tatar məktəbində səksən nəfər oxuyur, onlardan on üç nəfəri bizim məktəbə daxil olmaq üçün ərizə yazıb. Şəkidən iki, Gəncədən beş, Dərbənddən üç uşağın gəlməsi yəqindir. Qazaxdan da dörd-beş nəfər gələsidir. Görək sözlərinin üstündə duracaqlarmı?” Bu məsələyə Ə.Tanrıverdinin kitabında da toxunulmuşdur.

Ürək yanğısı ilə deyilən bu sözlər əsərdə tez-tez təkrar olunan “sentyabra qədər yığılan beş-altı uşağa” işarədir. Həmin uşaqların içində Azərbaycanın böyük maarifpərvər müəllimi və metodisti, hamımızın yaxşı tanıdığımız F.Köçərli də var idi. Çernyayevski F.Köçərlini Şuşadan gətirib seminariyada oxutdurmuşdu. Bununla da xalqımıza ədəbiyyatımızın cəfakeşi olan bir tənqidçi, ədəbiyyatşünas və pedaqoqu kəşf etmişdi. Əlbəttə, Azərbaycan xalqı, eləcə də onun bir parçası olan Şamaxı və onun ziyalıları A.O. Çernyayevskinin azərbaycanlı uşaqların savadlanması uğrunda apardığı mübarizəni heç zaman unutmamış və onun xatirəsini hər zaman uca tutmuşdur.

Vaxtilə Çernyayevskinin işlədiyi məktəb hal-hazırda onun adını daşıyır (Mərəzə 1№-li kənd məktəbi – P.P.), məktəbin önündə A.O.Çernyayevskinin büstü də qoyulub həmyerliləri bu böyük şəxsiyyəti dönə-dönə yad edirlər. 1990-cı ildə A.O.Çernyayevskinin anadan olmasının 150 illiyi qeyd olunanda, Mərəzə qəsəbə orta məktəbində geniş miqyaslı tədbir keçirilmiş, oraya Bakı şəhərindən ziyalılar dəvət olunmuş, prof. Z.Qaralov, dos. Z.Mehdizadə, dos. N.Nəcəfov çıxış etmişlər. Mərəzəlilərin atalarından, babalarından eşitdikləri xatirələr tədqiqatçılar üçün yeni tapıntılar olmuşdur.

Əlbəttə, bir bədii obraz, personaj kimi də Ə.Tanrıverdinin "Dəli Kür romanının poetik dili" əsərində A.O.Çernyayevskinin "bədii portretin" haqqında bəhs etməklə onu oxuculara daha yaxından tanıtdırmağa səy etmiş, həm də onun əbədiyaşar olmasına inam və ümid yaratmışdır.

Göründüyü kimi, böyük pedaqoq A.O. Çernyayevskinin istər ədəbiyyatda, istərsə də xatirələrdə yaşayan ölməz obrazı tariximizin ən şərəfli səhifələrindən biri kimi, bu gün də sevilir və yeni-yeni məlumatların üzə çıxarılmasına zəmin yaradır.

A.O.Çernyayevski obrazı gənc nəsli təhsil sahəsində mütərəqqi metodların tətbiq edilməsinə, Azərbaycan təhsil sırasında aparılan islahatların uğurla nəticələnməsi üçün əzimlə, fədakarlıqla çalışmaq yoluna səsləyir.

Hazırda təhsilimizdə dərslik problemləri ən prioritet sahələrdən birini təşkil edir. Dövlət bu sahəyə ardıcıl qayğı göstərir. Bu böyük işlərin təməli isə, Azərbaycan xalqını, onun dilini sevən, A.O.Çernyayevski kimi şəxsiyyətlər tərəfindən qoyulmuşdur.

*Rəyçi: prof. İ.İsayev*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan pedaqoji antologiyası. XIX əsr – XX əsrin əvvəlləri. Tərtib edən akad. H.Əhmədov. Bakı, 2011.
2. Şıxlı İ. Dəli Kür. Bakı, 1982.
3. Əzizxan Tanrıverdi. "Dəli Kür" romanının poetik dili. Bakı, 2013.
4. Qaradağlı V. A.O.Çernyayevski "Vətən dili". Bakı, 1968.
5. Seyidov Ə. Azərbaycanda pedaqoji fikrin inkişafı tarixindən. Bakı, 1958.
6. Ağayev Ə. Seçilmiş pedaqoji əsərləri. 2 cilddə, I cild. Bakı, 2011.
7. Görkəmli pedaqoq və maarif xadimi. // "Azərbaycan məktəbi" jurnalı, 2012. № 1.

**П.Пашаева**

**Черняевский в литературе и в воспоминаниях**

**Резюме**

В статье говорится о педагогической деятельности педагого, создавшего на азербайджанском языке учебник, имевшего большие заслуги в формировании азербайджанских учителей А.О.Черняевского.

**P.Pashayeva**

**Chernyayevski in the literature and memories**

**Summary**

The article is dedicated to the pedagogical activity of A.O.Chernyayevski, who wrote first Azerbaijan textbook and contributed in the development of Azerbaijan teachers.

***Tərbiyə məsələləri***

# MİLLİ-MƏNƏVİ DƏYƏRLƏR AİLƏNİN TƏRBİYƏ MƏKTƏBİDİR

**Miri Həsənov**
***pedaqogika üzrə fəlsəfə doktoru, dosent***

***Açar sözlər:*** *milli-mənəvi dəyərlər, tərbiyə, pedaqogika, müəllim, şagird.*
***Ключевые слова:*** *национально-морального, воспитание, педагогика, учитель, ученик.*
***Key words:*** *national moral values, upbringing, pedagogy, teacher, student.*

Qloballaşma dövründə dünya xalqlarının, o cümlədən İslam dünyasının tarixən yaratdığı adət-ənənələr, milli-mənəvi dəyərlər, ailə-nikah məsələləri, ailənin quruluşu və s. yenidən göz önünə gəlir. Yeni dünyada yeni əxlaqi tələblərlə üzləşməli olursan... Bu tələblərə cavab vermək, düzgün tərbiyə sistemi yaratmaq üçün "Qurani Kərim"ə, islam dəyərlərinə, şifahi xalq yaradıcılığına, milli, yazılı ədəbiyyatımıza daha dərindən bələd olmaq zərurəti yaranır...

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin sərəncamı ilə 2006-cı il 30 avqustda qəbul edilmiş Azərbaycan Gəncliyi Dövlət Proqramının (2005-2009) 1.17-ci bəndində göstərilən "Gənclərin milli-ənənəvi və dini dəyərlərə uyğun tərbiyə olunması işinin təkmilləşdirilməsi ön plana çəkilməlidir" çağırışı İslam dəyərlərinə əsaslanaraq gənclərin tərbiyəsinin təkmilləşməsinə münbit şərait yaradıldığının aydın təzahürüdür.

İslamın təşəkkülü dünya sivilizasiyasının tarixində çox mühüm hadisə olmuşdur. O, Ulu Yaradanın iradəsi və Onun Rəsulu Məhəmməd Peyğəmbərin cəsarətli, davamlı fəaliyyəti sayəsində meydana gəlmişdir. İslam dini dünyəvi sivilizasiyalardan biri olaraq, bəşər cəmiyyətinə ülvi mədəniyyət, mənəviyyat nümunələri bəxş etmişdir. Onlar Allahın vahidliyinə, gözəgörünməzliyinə, əvəzedilməzliyinə, onun yenilməz ilahi qüdrətinə, mərhəmətinə və axirət dünyasına inam, iman və itaət, onun qarşısında pak, sədaqətli, mərhəmətli, rəhimli, əqidəli, cəsarətli, fədakar, humanist, xeyirxah, təvazökar və s. mənəvi dəyərlərdə özünü təcəssüm etdirir. Bu sıraya islam ümmətinin Allah qarşısında itaətə, inama, mənəvi saflığa, əqidəliliyə, sədaqətə dəlalət edən namaz, orucluq, həcc və digər müqəddəs dini yerləri ziyarət də daxildir.

- İslamın, onun mənəvi dəyərlərinin meydana gəlməsi və formalaşmasının nəsillərə ötürülməsi imkan və yollarının izlənilməsi müasir tələblər baxımından da çox vacib və önəmlidir;

- Araşdırmalar göstərir ki, islam dəyərləri çox zəngin nəzəri bazaya malikdir. Bu, özünü müqəddəs "Qurani Kərim"də, Məhəmməd Peyğəmbərin və imamların hədis və deyimlərində də göstərir;

- Mövcud şəraitin, milli adət-ənənələrin, təlim alanların yaşayış tərzinin, mənəvi səviyyəsinin nəzərə alınması böyüməkdə olan nəslin, o cümlədən şagirdlərin islam mənəvi dəyərləri əsasında tərbiyəsinin səmərəliliyində mühüm şərtdir;

Məlumdur ki, bəşər cəmiyyətinin bütün inkişafı tarixində yaşlı nəslin nümayən-

dələri uşaqların inkişafı və tərbiyəsinin qayğısına qalmışlar. Uşağın qayğısına qalmaq və onu tərbiyə etmək, hər şeydən əvvəl, ona görə zəruri olmuşdur ki, insan son dərəcə aciz və müstəqil yaşamağa qabil olmayan bir məxluq kimi doğulur və onun uşaqlıq çağları uzun müddət davam edir. Əgər bu müddət ərzində uşağın mühafizə olunmasına müntəzəm qayğı göstərilməzsə, tərbiyəsinə fikir verilməzsə, uşaq yaşlılar tərəfindən bəslənib yetişdirilməzsə, o, cismən və ən başlıcası isə mənən məhv olar, insan nəsli inkişaf edib artmaz. Halbuki öz nəslini davam etdirmək qayğısına qalmaq insanda da sövqi-təbiidir. İnsanlar heç vaxt rahat qocalığı təmin edən, "bel bağlamağa" ümid verən etibarlı nəsil yetişdirmək üçün əllərindən gələni əsirgəməmişlər. Beləliklə, uşaqların-varislərin inkişafı və tərbiyəsi ilə məşğul olmaq insanların, hər şeydən əvvəl, öz nəslini artırıb inkişaf etdirməsi, son nəticədə isə cəmiyyətin irəliyə doğru inkişafını təmin etməsi üçün zəruridir. Yaşlı insanlar öz nəsillərini, cəmiyyəti yaşatmaq və irəliyə doğru inkişaf etdirmək üçün uşaqları ictimai həyata hazırlamalı, onları tərbiyə etməlidilər. Bütün bunlar göstərir ki, tərbiyə insanların ictimai əmək fəaliyyəti prosesində yaranmış, bəşəriyyətin praktik tələbatından asılı olmuş və cəmiyyətin yarandığı lap ilk vaxtlardan meydana gələrək onun inkişafına təsir göstərən mühüm bir vasitə olmuşdur.

Beləliklə, sözün əsl mənasında tərbiyənin məzmunu və yolları haqqında mülahizə, fikir və təkliflər irəli sürülür, sınaqdan keçirilir və uzun illər boyu bir nəsildən başqa nəslə ötürülür. Pedaqogika elminin tarixinə bu baxışdan yanaşsaq, ona aid fikirlərə çox qədimdən bəri, daha doğrusu, bəşər cəmiyyətinin yarandığı vaxtdan etibarən təsadüf edildiyini söyləyə bilərik. Bu mənada Azərbaycanın görkəmli ictimai xadimlərindən və pedaqoqlarından olan S.M.Qənizadənin aşağıdakı sözləri çox yerində səslənir: "Dünyada hər bir iş və hər bir sənət tədriclə kamala çatdığı kimi, tərbiyə işi də qərinələr təcrübəsilə imtahanlardan çıxıb bu əsrimizdə dərəcəyi kəmalə yetişibdir".

Doğrudan da, şifahi xalq ədəbiyyatı nümunələri ilə tanışlıq göstərir ki, zəhmətkeş xalq tərbiyə sahəsində bir sıra adət və ənənələr, qayda və qanunlar yaratmışdır. Heç bir yerə yazılmamış olan bu adət və ənənələrin, qayda və qanunların əhatə dairəsi geniş olub, insanın öz-özünə, başqalarına, vətənə, təbiət və cəmiyyət hadisələrinə münasibətinə, adamın nə kimi sifətlərə, hansı keyfiyyətlərə yiyələnməsi məsələlərinə, müasir istilahlarla desək, pedaqogikanın ümumi məsələlərinə, təhsil, təlim və tərbiyənin mahiyyətinə, məzmununa, məqsədinə, forma və üsullarına, ailə tərbiyəsinə, tərbiyəçi probleminə və s. aiddir. Bütün bu məsələlər barəsində zəhmət adamlarının ya müstəqil şəkildə, ya dolayı yollarla, ya məcazi şəkildə, ya da ki, eyhamlarla və s. vasitələrlə ifadə etdiyi son dərəcə dərin və dəyərli fikirlər tarix boyu milyon-milyon insanların, o cümlədən maarifpərvər şair və ədiblərimizin ümumi inkişafına qüvvətli təsir göstərmişdir.

Yazılı ədəbiyyatımızın çox görkəmli nümayəndələrindən olan Q.Təbrizinin, M.Gəncəvinin, F.Şirvaninin, Ə.Xaqaninin, N.Gəncəvinin (XI-XII əsrlər), İ.Həsənoğlunun, Nəsiminin (XIII-XIV əsrlər), M.Füzulinin, Ş.Xətainin (XVI əsr), S.Təbrizinin (XVII əsr), M.P.Vaqifin, M.V.Vidadinin (XVIII əsr), A.Bakıxanovun, Q.Zakirin, M.F.Axundzadənin, S.Ə.Şirvaninin, H.Zərdabinin (XIX əsr), C.Məmmədquluzadənin, Ə.Haqverdiyevin, M.Ə.Sabirin (XX əsr) və başqalarının yaradıcılığından bunu sübut edən çoxlu misallar gətirmək olar. Məsələn, N.Gəncəvinin yazdığı orijinal nağıllardan "Bəhramın ova çıxması" nağılı öz quruluşu və ideyası etibarı ilə "Ovçu Məmməd" xalq nağılına, "Xeyir və Şər" nağılı isə "Mərd və Namərd" nağılına oxşayır. Bu nağıllardan çı-

xan tərbiyəvi nəticə də eynidir: adam gördüyü işin məqsədini özü üçün aydınlaşdırsa, hər cür çətinliyə qalib gələ bilər.

Azərbaycan və İslam dünyası nümunəsindən əldə edilmiş elmi ümumiləşdirmələr və nəticələr əsasında təhsil prosesində şagirdlərin islam mənəvi dəyərləri əsasında tərbiyəsinin səmərəsini yüksəltmək naminə aşağıdakı əməli təklifləri təqdim etmək məqsədəuyğun olardı:

- İslam mənəvi dəyərlərini aşılayarkən nəinki ölkənin, habelə təhsil müəssisələrinin yerləşdiyi mühit nəzərə alınmalıdır;
- İslam mənəvi dəyərlərini böyüməkdə olan nəslə aşılayarkən siniflərin ümumi bilik və mənəvi səviyyəsi ilə yanaşı, şagirdlərin fərdi mənəvi hazırlıqları, psixoloji durumları öyrənilməlidir;
- İslam mənəvi dəyərlərini şagirdlərə aşılayarkən ailə və məktəbin birgə işinə diqqət yetirilməlidir;
- Azərbaycan Respublikasında tədris prosesində şagirdlərin islam mənəvi dəyərləri əsasında tərbiyəsi zamanı müəllim və ailənin yeri, birgə tərbiyə işi müəyyənləşdirilmişdir.

Şagirdlərin tədris prosesində islam mənəvi dəyərlərini kompleks şəkildə aşılayarkən bəzi mənəvi dəyərlərə (namaza, oruca, həccə, möhkəm əqidəliliyə, mənəvi saflığa, təvazökarlığa və s.) üstünlük verilməlidir.

Şifahi xalq yaradıcılığının qaynaqlarına əsaslanmaq bugünkü gənclərimiz üçün daha çox əhəmiyyətlidir.

Ailə münasibətlərində, ailə-nikah məsələlərində gənclərin islam əxlaqi nəzəriyyəsi ilə dərindən tanışlığı daha çox vacibdir.

Fikrimizcə, təqdim olunan təkliflərin nəzərə alınması ailənin, o cümlədən şagirdlərin islam mənəvi dəyərləri əsasında tərbiyəsinin səmərəsini daha da yüksəldərdi.

*Rəyçi: prof. Ə.Ağayev*

**İstifadə edilmiş ədəbiyyat**

1. Kazımov N. Məktəb pedaqogikası. Bakı, 2009.
2. Axund Hacı Salman. Hidayət yolu. Bakı, 2000.
3. Baxışova S. İslam dəyərləri və kiçikyaşlı uşaqların mənəvi tərbiyəsi. Bakı, 2009.
4. Həşimov Ə., Sadıqov F. Azərbaycan xalq pedaqogikası. Bakı, 2000.

**М.Гасанов**

**Национально-моральные ценности источник семейного воспитания**

**Резюме**

В статье говорится о роли национально - моральных ценностей в формировании учащихся как личность отмечается забота старшего поколения во всех этапах развития общества.

**M.Hassanov**

**National moral values is the upbringing school of family**

**Summary**

In the article it is spoken about the role of national moral values in forming students' personality. It is noted that the adults always took care of the youth in the development history of the society.

# TƏLƏBƏLƏRİN ŞƏXSİYYƏT KİMİ FORMALAŞMASINA DAİR

**Zülfiyyə Şiriyeva**
***Xalq Təhsili Muzeyinin direktor müavini***

***Açar sözlər:*** *ali təhsil, tərbiyə sistemi, şəxsiyyətin formalaşması, gənclər, milli-mənəvi dəyərlər.*

***Ключевые слова:*** *высшее образование, система воспитания, формирование личности, молодежь, национально - моральные ценности.*

***Key words:*** *higher education, education system, formulating of personality, the youth, national-moral values.*

Müasir mərhələdə bütün sahələrdə həyata keçirilən iqtisadi, sosial, mədəni islahatların nəticəsi olaraq ölkəmiz dinamik inkişaf yolu ilə inamla irəliləyir, onun beynəlxalq aləmdə nüfuzu güclənir. Respublikamızda hər bir sahədə müşahidə olunan fasiləsiz inkişaf tendensiyası özünü təhsil sektorunda da göstərir. Bu inkişafın əsasında ulu öndər Heydər Əliyevin ideyaları və həmin ideyaların işığında həyata keçirilən aydın və ardıcıl strateji kurs dayanır. Möhtərəm Prezidentimiz İlham Əliyevin rəhbərliyi ilə müəyyənləşdirilən və icra edilən dövlət proqramları təhsil sistemində keyfiyyətcə yeni inkişafa, yüksək nəticələrin əldə edilməsinə geniş imkan və şərait yaradır. Ölkəmizdə aparılan islahatlar təhsil siyasətinin səmərəliliyini artıran nəticələrə gətirib çıxarmışdır. İslahatın qarşıya qoyduğu vəzifələrin uğurla həyata keçirilməsi isə müəllimin pedaqoji – psixoloji hazırlığı onun işə yaradıcı münasibəti və pedaqoji ustalığı ilə çox bağlıdır. Yalnız yüksək savada və intellektual potensiala malik olan, tədris etdiyi fənnin metodikasını, müasir təlim metodlarını mükəmməl bilən, yeni texnologiyalardan yaradıcılıqla istifadə etməyi bacaran müəllim bu işlərin öhdəsindən məharətlə gələ bilər. Tədris prosesində nəzəriyyə ilə praktikanın vəhdəti mühüm amildir.

Hər bir dövlətin və millətin tərəqqisində onun təhsili müstəsna əhəmiyyət kəsb edir. Təhsil cəmiyyətin tərkib hissəsi olduğundan orada baş verən bütün prosesləri özündə əks etdirir. Cəmiyyəti, tarixi-mədəni təcrübəni, insanların həyat tərzini, dəyərlərini formalaşdırma və inkişafetdirmə vasitəsi olan təhsil mahiyyət və məzmununa görə dünyanın hər yerində cəmiyyətin mühüm inkişaf parametri kimi qiymətləndirilir. Ölkəmizdə dünyanın davamlı inkişaf prinsiplərinə söykənən inteqrativ xarakterli təhsil sisteminin təşkili prosesi həyata keçirilir. Müasir təhsilin üzərinə ailənin, cəmiyyətin və dövlətin maraqlarına uyğun zəruri biliklərə, həyati bacarıqlara, İKT-dən səmərəli istifadə vərdişlərinə yiyələnən, əxlaqi-mənəvi dəyərlər zəminində tərbiyə olunan vətəndaş yetişdirmək vəzifəsi düşür.

Şəxsiyyətin hərtərəfli və harmonik inkişafı bu gün başlıca məqsəddir. İnsanın inkişaf perspektivi onun aldığı təhsilin keyfiyyətindən və tərbiyəsindən asılıdır. Yüksək təhsilli, rəqabətədavamlı insan dövlət və millətin sərvətidir. İstedadlı, bacarıqlı, yüksək təhsilə və tərbiyəyə malik insanlar xalqın intellektual və mədəni varlığını təmin və

təcəssüm edir. Ziyalı insanlar öz yaradıcılığı və fəaliyyəti ilə cəmiyyətin mədəni səviyyəsini yüksəldir. Cəmiyyətin elitar təbəqəsinin formalaşmasında, maddi sərvətlərin insan kapitalına çevrilməsində, insanın daha sivil və kamil səviyyəyə yüksəlməsində ali təhsilin başlıca rolu vardır.

Hər bir cəmiyyətdə tərbiyə onun başlıca vəzifəsi hesab edilir. İnsan amilinin əsas yer tutduğu hazırki dövrdə gənc nəslin dünyagörüşünə, yüksək əxlaqi keyfiyyətlərə malik olan, ahəngdar inkişaf etmiş, ictimai cəhətdən fəal olan, mənəvi zənginliyi, əxlaqi saflığı və fiziki kamilliyi özündə birləşdirən şəxsiyyət kimi tərbiyə olunması bir vəzifə kimi qarşıda durur. Bu mühüm vəzifənin həyata keçirilməsində müəllimlər, təhsil müəssisələri, o cümlədən ali məktəblər həlledici mövqe tutur.

Ali məktəblərdə təhsilalanlar daha mükəmməl biliklərə yiyənlənmək istəyən gənclərdir. Onların şəxsiyyət kimi inkişafı fəaliyyətlərindən asılı olub özünütəkmilləşdirmə meyilləri ilə bağlıdır. Tərbiyə burada əsas faktor kimi çıxış edir. İstedadlıların, iti zəkaya malik insanların tərbiyəyə daha çox ehtiyacı var, çünki fəal ağıl faydalı işlərlə məşğul olmazsa, faydasız, boş və zərərli işlərlə məşğul olar. Qanunun qadağan etmədiyi bəzi şeyləri etik normalar da qadağan edir.

Pedaqogikanın başlıca kateqoriyalarından biri olan tərbiyə - milli və bəşəri dəyərlərlə əlaqədar davranış və mənəvi keyfiyyətlərin məqsədyönlü, planlı və mütəşəkkil şəkildə aşılanması prosesidir (3, s.16).

Konkret olaraq tərbiyə məfhumu - təhsil verməklə, hər hansı bir adət, ədəb və davranış qaydalarını aşılamaqla yetişdirib böyütmə; insanın ümumi inkişaf, sistematik təsir və təlim nəticəsində biliyə, mədəni vərdişlərə və s. yiyələnməsi, gözəl əxlaq deməkdir.

İnsan yaşadığı cəmiyyətin üzvləri ilə rəftarında etik normalar və əxlaqi prinsiplər çərçivəsində hərəkət etməlidir. İnsanın daxili, ruhi aləmi ilə bağlı olan mənəvi keyfiyyətlər - şərəf, ləyaqət, düzlük, təvazökarlıq, nəzakətlilik, təmkinlilik, cəsarətlilik, insanpərvərlik, mərdlik, sadəlik, dostluq, ədalətlilik, əməksevərlik, xeyirxahlıq, sədaqətlilik, vətənpərvərlik və s. onun mənəviyyatının və yüksək əxlaqının təzahürüdür. Alman filosofu İmmanuil Kantın fikrincə, mənəviyyat bizə xoşbəxt olmağı deyil, xoşbəxtliyə necə nail olmağı öyrədir (6, s.148). Fransız filosofu və mütəfəkkiri Jan Jak Russo isə belə hesab edirdi ki, insanın bütün mənəviyyatı onun niyyət və əməllərindən irəli gəlir və onlarla ölçülür (6, s.150).

Ailədən başlayaraq müxtəlif növ təhsil müəssisələrində davam edən tərbiyə prosesi şəxsiyyətin formalaşmasında əhəmiyyətli olan mənəvi münasibətlər zəminində qurulur. Bu münasibətlər insanın həyat və fəaliyyətinin müxtəlif sahələrinə nüfuz edir, onun şəxsi simasına, insanlarla əlaqəsinə, özünü qiymətləndirməsinə təsir göstərir. Yüksək əxlaqi prinsiplər ilə yaşamağa və fəaliyyət göstərməyə, birgəyaşayış qaydalarına əməl etməyə daxili tələbat oyadır. Y.A.Komenski təliminin istinad etdiyi fikir və ideyalara görə, biz insanın tərbiyəsi ilə məşğul oluruqsa, bu sahədə uğur qazanmaq istəyiriksə, insanın mahiyyətini düzgün öyrənməliyik. İnsanlar biri-birindən öz qabiliyyətlərinə görə nə qədər fərqlənsələr də, onlara eyni üzvlərə malik bəşəri-təbiət xasdır (4, s.91).

Hər bir tarixi dövr özünün sosial-iqtisadi şəraitinə, tərbiyə sisteminə müvafiq ictimai-sosial varlıq olan şəxsiyyətlər yetişdirir. Fransız filosofu Klod Adrian Helvetsinin fikrincə, biz hamımız aldığımız tərbiyənin övladlarıyıq (6, s.448).

Lakin bəşəriyyətin yüz illər boyu əldə etdiyi, zənginləşdirdiyi və gələcək nəsillərə ötürdüyü mənəvi sərvətlər və dəyərlər şəx-

siyyətin formalaşmasında mühüm amil kimi çıxış edir. Eyni zamanda insanın sosial-mənəvi mühitdə mövqeyi, elmi münasibəti, intellektual səviyyəsi, daxili aləmi, həyat tərzi, mentaliteti onun şəxsiyyət kimi formalaşmasını təmin edir.

Sürətlə inkişaf etməkdə olan elmi-texniki tərəqqinin hərəkətverici, idarəedici qüvvəsi olan, ölkənin istər siyasi, istərsə də mədəni həyatında fəallıq göstərə biləcək gəncliyin təhsili ilə yanaşı, tərbiyəsi məsələləri də ali məktəb pedaqoqlarının üzərinə düşür.

Tərbiyənin mərkəzində şəxsiyyətin mənəvi özəyini formalaşdıran əxlaq tərbiyəsi dayanır. Tələbələrin mütəxəssis kimi hazırlanması onların əxlaqi tərbiyəsi ilə paralel həyata keçirilməlidir. Tərbiyəvi işlərin köməyi və təsiri ilə fərdin mənəvi aləminə nüfuz edərək, tələbənin ahəngdar inkişafını təmin etmək olar.

Müasir gənclərin böyük bir ordusunun toplaşdığı ali məktəblərdə tərbiyə işinin təşkili lazımi səviyyədə həyata keçirilərsə, arzuedilən nəticəyə nail olmaq olar.

Tələbə-müəllim, tərbiyə olunanla tərbiyəçilər arasında münasibətlərinin yeni prizmadan tənzimlənməsi, tərbiyə işində məqsədin məzmununun müasir tələblər baxımından təkmilləşməsi artıq günün tələbinə çevrilmişdir. Tərbiyə prosesinin mahiyyətinin aydın və dəqiq ifadəsi onun qanunauyğunluqlarına müvafiqdir: Müəllimin tələbkarlığı ilə hörməti vəhdət halında olarsa, tərbiyəvi tədbirlərin məzmunu real həyati faktlara istinad edilərsə tələbələrin tərbiyəsinə müsbət təsir göstərər. Tərbiyə işinin məqsədi düzgün müəyyənləşdirilib həyata keçirilərsə, tərbiyə olunanın fərdi xüsusiyyətləri nəzərə alınarsa, onlar tərbiyə işinin təkcə dinləyicilərinə deyil, fəal iştirakçılarına çevrilərsə onun səmərəsi bir o qədər artar. Eyni zamanda hər hansı mənəvi keyfiyyəti formalaşdırmaq üçün müəllimin seçdiyi üsul tərbiyə olunanın həmin keyfiyyət üzrə tərbiyəlilik dərəcəsinə uyğun gəlməlidir.

Tərbiyə şəxsiyyətin formalaşmasına yönəldilmiş xüsusi fəaliyyət sahəsidir. Tərbiyə şəxsiyyətin daxili və xarici amillərin təsiri altında baş verən inkişafının idarə olumasıdır. Bu prosesdə şəxsiyyətin formalaşmasının cəhətlərinin nəzərə alınması zəruridir.

Bu gün tədris müəssisələrində tərbiyəvi işlərin təşkili formalarının təkmilləşdirilməsi, gənclər arasında maarifləndirmə və təbliğat işlərinin gücləndirilməsi, sosial mühitin və kütləvi kommunikasiya vasitələrinin mənfi təsirinin korrektə edilməsi zərurətini yaradır. Gənc nəslin fiziki və mənəvi sağlamlığı daim dövlət və cəmiyyətin diqqət mərkəzində duran məsələlərdəndir.

Tərbiyə işi tərbiyə prosesinin əsas komponenti, tərkib hissəsidir. Tərbiyə işində əsas yer nəzərdə tutulan məqsəddir. Tərbiyənin məqsədi həqiqi insan yetişdirməkdir. Pedaqoji proses qarşısında qoyulan hərtərəfli inkişaf etmiş şəxsiyyət tələbi Azərbaycan Respublikasının Təhsil Qanunun 4-cü maddəsinin 1-ci və 2-ci bəndlərində də öz əksini tapmışdır:

- Azərbaycan dövləti qarşısında öz məsuliyyətini dərk edən, xalqının milli ənənələrinə və demokratiya prinsiplərinə, insan hüquqları və azadlıqlarına hörmət edən, vətənpərvərlik və azərbaycançılıq ideyalarına sadiq olan, müstəqil və yaradıcı düşünən vətəndaş və şəxsiyyət yetişdirmək;
- Milli-mədəni və ümumbəşəri dəyərləri qoruyan və inkişaf etdirən, geniş dünyagörüşünə malik olan, təşəbbüsləri və yenilikləri qiymətləndirməyi bacaran, nəzəri və praktiki biliklərə yiyələnən, müasir təfəkkürlü və rəqabət qabiliyyətli mütəxəssis-kadrlar hazırlamaq (1, s.15).

Böyüyən nəsillərin tərbiyəsi və bu prosesdə milli - mənəvi dəyərlərdən istifadə metodikası indiki şəraitdə xüsusilə aktuallaşmışdır. Adət-ənənələr əsasında dayanan

milli-mənəvi dəyərlər xalqın ülvi hislərinin parlaq ifadəsidir. Ali məktəblərdə gənclərin milli-mənəvi və ümumbəşəri dəyərlər əsasında tərbiyə olunması işində müasir tərbiyə sistemi ilə bağlı yeniliklərə istinad olunmalıdır.

Milli-mənəvi tərbiyənin imkanları dedikdə, buraya şəxsiyyətin formalaşmasına təsir göstərən dəyərlər şamil edilir. Milli-mənəvi tərbiyə pedaqoji prosesdə həyata keçirilən müxtəlifnövlü fəaliyyətin stimullaşdırılması və təşkilini nəzərdə tutur. O, şəxsiyyətdə praktik bacarıqlar, sosial və mənəvi münasibətlər formalaşdırır (2, s.69).

Ali məktəblərdə tərbiyə işinin səmərəli təşkili vətəni sevən, onun iqtisadi, siyasi, mədəni cəhətdən çiçəklənməsinə xidmət edən, azadlığı və ərazi bütövlüyü uğrunda canından belə keçməyə hazır olan, dövlətçilik və azərbaycançılıq ideyalarını yaşadan vətəndaş yetişdirməyə kömək edər. Azərbaycan gəncliyinin daha savadlı, zəkalı, yenilikçi, müstəqil düşüncəli, əzmkar, öyrənmək həvəsinin tükənməz olması üçün cəmiyyət bu işə fəal qoşulmalıdır. Fasiləsiz, intensiv və məqsədyönlü tərbiyə prosesi olmadan nə cəmiyyət mövcud ola bilər, nə də ayrıca insan şəxsiyyət kimi formalaşa bilər.

Ölkənin gələcək taleyi onun gənclərindən asılı olduğu üçün təhsildə aparılan islahatlar milli ənənələrə və dəyərlərə söykənərək şəxsiyyətin formalaşmasına xidmət edir.

*Rəyçi: əməkdar müəllim A. Muradov*

**İstifadə edilmiş ədəbiyyat**


1. “Təhsil haqqında” Azərbaycan Respublikasının Qanunu. Bakı: Qanun, 2009.
2. Əliyev P., Əhmədov H. Gənclərin milli-mənəvi dəyərlər əsasında tərbiyəsi. Bakı: Təhsil, 2006.
3. Kazımov N. Ali məktəb pedaqogikası. Bakı: Nicat, 1999.
4. Komenski Y. Böyük didaktika. Bakı: Elm və təhsil, 2012.
5. Баранов Х. Арабско-русский словарь. М.: Валерий Костин, 2005.
6. Cəfərov M., Ramizoğlu S. Ağıla və qəlbə işıq saçan sözlər. Bakı: Nurlan, 2009.


**З.Шириева**

**Некоторые проблемы о формировании студентов как личность**

**Резюме**

Настоящая статья представляет обзор о роли воспитания в формировании молодежи как личность. Также раскрывается значение рациональной организации воспитательной работы в вузах во всестороннем развитии человека, повышении цивилизованного уровня, воспитании молодежи как гражданина соединявшего в себе моральные ценности, нравственную чистоту и физическую зрелость.

**Z.Shiriyeva**

**Problems of formulating personality of university students**

**Summary**

The article is dedicated to the formulating of the youth personality. It is noted that making a good citizen is the main goal of education and it is closely connected with the development of physical and mental ability of students and developing national moral values.

# DÜNYANIN GÖRƏN GÖZÜNƏ ÇEVRİLƏN DÜHALAR BARƏDƏ

**Firəngiz Hidayətova**
***pedaqogika üzrə fəlsəfə doktoru***

***Açar sözlər:*** *dahi, sivilizasiya, istedad, bacarıq, vərdiş, şəxsiyyət, ehtiras, fantaziya, emosiya, təxəyyül.*

***Ключовые слова:*** *гений, цивилазиция, талант, умение, навык, личность, страсть, фантастика, эмоция, воображение.*

***Key words:*** *genius, civilization, talent, ability, habit, personality, passion, fantasy, emotion, imagination.*

Alimlik və dahilik elmə adi adamlardan fərqli yanaşmadır. Tarixin, mühitin, bəşəriyyətin gözündə, düşüncəsində dahilik statusu almış insanların hamısında dünyaya sevgi öz vətənindən, öz xalqından, millətindən başlanır. Dahilər hansı vəzifəni daşımalarından asılı olmayaraq, hamısı ədalətli olur, qaydalara, ənənələrə hörmətlə yanaşır, milləti, vətəni hər şeydən uca tuturlar. İnsanın "bəsirət gözü" açıldıqda onlar dünyanın görən gözünə çevrilirlər.

Tarixən kimi dahi hesab etmək olar problemi alimləri, pedaqoqları, metodistləri həmişə düşündürmüşdür. Bu gün də düşündürür. Çox təəccüblü olsa da planetimizdə dahi adına müxtəlif araşdırmalar və sorğuların nəticəsi olaraq cəmi 400 şəxsiyyət layiq görülmüşdür. Bir faktı da demək yerinə düşər ki, bütün müsəlmanların peyğəmbəri Məhəmməd (s.ə.s) məhz bu dahilərin birincisi hesab olunub. Əlbəttə ki, beşminillik sivilizasiyaya malik planetimiz üçün bu rəqəm olduqca azdır. Yəni dahilər çox az yaranırlar. Dahilər insanları cəlb etdikləri kimi eyni zamanda onları narahat edir və qorxudurdular. Çox zaman dahilərin özləri bilirdilər ki, onlar qeyri-adi istedad sahibləridirlər, yəni dahidirlər. Lakin onlar öz dahiliklərini gizlətməyə çalışırdılar.

A.Şopenhaur yazır: "Dahilik ancaq xalis idrak subyekti, dünyanın aydın gözü olmaqla, şəxsi marağın, şəxsi istəyin, şəxsi məqsədin tamam unudulması və buna görə də müvəqqəti olaraq öz şəxsiyyətindən imtina edilməsidir".

Azərbaycan MEA-nın müxbir üzvi, prof. V.Abbasovun "Dahilərin, müdriklərin və fatehlərin həyat dərsləri" kitabından götürülmüş bu sətirlər dünya dahiləri haqqında aydın təsəvvür yaratmağa kömək edir. Prof. V.Abbasov "Giriş"də yazır: "Dünyanın ən ali, ən demokratik, ən humanist dinlərindən biri olan İslam dininin banisi, Allahın elçisi, idarəçilik, sərkərdəlik məharəti, aqilliyi, mərhəməti ilə ən uca zirvədə dayanan və bəşər tarixinin bütün dövrlərində bu aqilliyini saxlayan Həzrət Məhəmməd Peyğəmbərimiz (s.ə.s) müqəddəsdir".

Sonra bu kitabda Teymurləng, Şeyx Şamil, Atatürk, Üzeyir bəy, Yusif Məmmədəliyev, Heydər Əliyev, Lütfi-Zadə, Vasim Məmmədəliyev kimi dünyaca məşhur şəxsiyyətlərdən söhbət açır, onların böyüklüyünü çox incə və inandırıcı dəlillərlə təsvir edir.

Bu dahilərin, müdriklərin, fatehlərin həyat yoluna nəzər saldıqda, mənəvi dünyamızın zənginləşməsində, həyatımızın uğurlu

alınmasında dahiləri öyrənmənin nə qədər əhəmiyyətli olduğuna oxucuları inandırmışdır.

Biz bu məqaləmizdə əsasən incəsənət sahəsi ilə bağlı olan dahilərin həyatından bəhs etməyi lazım bilmişik.

Qədim dövrdən dahiliyin sirrini öyrənmək üçün filosoflar, yazıçılar, psixoloqlar öz tədqiqatlarında bu və ya digər dərəcədə bu keyfiyyətləri aydınlaşdırmağa çalışmışlar. Çoxları dahiləri ilahi qüvvə ilə bağlayır. Hətta bu gün də bir sıra alimlərin, pedaqoq və psixoloqların bir qismi dahiliyi kosmik qüvvə ilə bağlayırlar. Başqaları, o cümlədən Şopenhauer qeyd edir ki, hər bir uşaq dahidir. Belə ki, məktəbə qədər uşaq ətraf mühitin təsiri ilə (ata-ananın, qonşuların, yaşıdlarının, televiziya və radionun və s.) sərbəst danışmağı öyrənir, bir neçə dildə öz fikrini söyləyir, mahnı oxuyur, rəqs edir və s. Bütün bunlara uşaqlar heç bir tərbiyə tədris müəssisəsində olmadan da yiyələnirlər. Yəni belə uşaqların müəllimləri öz valideynləri və ətraf mühit olur. Məşhur rus yazıçısı, eyni zamanda uşaq psixologiyasını yaxşı başa düşən Korney Çukovski özünün “İkidən beşə qədər” adlı kitabında qeyd edir ki, iki yaşdan beş yaşa qədər kiçik müddətə bütün uşaqlar dahi linqvist olurlar.

Bir çoxları talantı nəsildən-nəslə keçməsilə, yəni irsiliklə izah edirlər. Bunda da, əlbəttə ki, müəyyən əsas vardır. Yəni dahi alman bəstəkarı İohan Sebestyan Baxın nəslindən 56 istedadlı musiqiçi yetişmişdir. Bunların iyirmisi əla musiqiçi olmuşlar.

İsveçrədə Bernullilər ailəsindən 14 görkəmli riyaziyyatçı alim yetişmişdir.

Tisian, Van-Deyk, Darvin, M.Ştraus, Küri nəsillərində görkəmli şəxsiyyətlər yetişmişdir. Lakin adi ailələrdə də dahilərin yetişməsi faktları olmuşdur.

“Dahiliyin potolijiliyi” nəzəriyyəsinə görə isə guya dahi olan hər bir insan orqanizmində hansısa normallıqdan kənara çıxmalar mövcuddur.

Bu nəzəriyyəyə görə belə adamların psixologiyasında müəyyən dəyişikliklər olur. Hətta italiyalı psixiatr Lambrozo bununla əlaqədar “Dahilik və dəlilik” adlı kitab yazmışdır. Hətta bu nəzəriyyə tərəfdarları insan beyninin böyüklüyünün dahiliklə düz mütənasib olduğunu qeyd edirdilər.

Lakin dahi adamların çoxunun beyinlərinin həcmi heç də böyük olmamışdır.

XVIII əsr fransız filosofu Helvetsiy özünün “Ağıl haqqında” kitabında dahiliyin tərbiyə və təlim prosesində formalaşdığını söyləyir. Bu nəzəriyyə o dövrdə burjuaziyanın yarandığı ilk vaxtlar olduğundan Avropada çox populyarlaşır və geniş yayılır.

Yuxarıda göstərdiyimiz dahilik haqqında beş nəzəriyyə, demək olar ki, bu fenomeni tamamilə aydınlaşdıra bilmir. Son 100 il ərzində də bu problemə alimlər çox az diqqət yetirmişlər. Ona görə də dahilik problemini aydınlaşdırmaq üçün bilavasitə dahilərin öz fikirlərinə müraciət edək.

Bununla əlaqədar əvvəlcə bacarıq, istedad və dahilik kimi anlayışları özümüz üçün aydınlaşdıraq.

- Bacarıq–şəxsiyyətin xarakteristikası olub, müəyyən fəaliyyətlərin qavranılmasının məzmununu özündə əks etdirir.

- Bacarıqların şəxsiyyətdə inkişaf etməsinin səviyyə və dərəcəsi istedad və dahiliyi əks etdirir.

- İstedad deyəndə müəyyən bacarıqların məzmununun müəyyən fəaliyyətin nəticəsinə çevrilməsi nəzərdə tutulur və bu fəaliyyətin nəticəsi öz orijinallığı, yeniliyi, mütləq əhəmiyyətliliyi ilə fərqlənməlidir.

- Dahilik–istedadın ən yüksək zirvəsi hesab olunur və dahilər tərəfindən edilən böyük kəşflər deyilənlərə görə haradansa məlum olmayan qüvvə tərəfindən, yəni yuxarıdan bizlərə göndərilir. Məsələn, dahi Avstriya bəstəkarı V.A.Motsartdan öz əsərlərini necə yazması barədə soruşanda adətən belə

cavab verirmiş: “Haradan və necə–mən bunu bilmirəm və mənim burada iştirakımı da izah edə bilmirəm”.

Yaxud Mendeleyev öz cədvəlini yuxuda görmüş və nəhayət, uzun axtarışın nəticəsi olmuşdur.

Rus şairi Fetin bu fikri çox maraqlıdır: “Mən bilmirəm ki, nə oxuyacağam, lakin mahnı yaranır”. Bu cür misalları çoxlu miqdarda çəkmək mümkündür və bunlar bir daha bizi belə bir fikrə gəlməyə vadar edir ki, əsl dahilərin bizə məlum olmayan və bilavasitə kosmosla əlaqədar qüvvələrlə əlaqələri olur. Bu dahi adamlar kosmosla adi insanlar arasında bir növ vasitəçi olurlar və adi insanların bilmədikləri, başa düşmədikləri, görmədikləri şeyləri onlar görür, başa düşür, anlayırlar.

Bir çox tədqiqatçılar dahilərdə intuisiyanın, təxəyyülün, fantaziyanın inkişaf etdiyini göstərirlər və qeyd olunur ki, məhz bu keyfiyyətləri yeni gözəl əsərlərin, elmi tapıntıların yaranmasına əsas təkan verən bir vasitə hesab etmək olar.

Böyük rus yazıçısı M.Qorkinin fikrincə, intuisiya təəssüratlardan yığılaraq yaranır, lakin hələ şüurda formalaşmır və fikir, yaxud obraz kimi qəbul olunur.

Təxəyyül – şüurda təəssüratlardan müxtəlif tərkib hissələrin və onlardan da yeni psixoloji əhvalların yaranmasına səbəb olan bacarıqdır. Təxəyyül insanda olan hissiyyat təcrübəsinin istifadəsinə əsaslanır. Təxəyyülün mənbəyi-həmişə obyektiv həqiqət olub, insan fantaziyasının fəaliyyətindən asılıdır. Bir sıra dahilərin təbirincə desək, hətta riyaziyyatda belə fantaziyasız keçinmək olmaz.

Yaradıcılıq prosesində emosiyanın rolunu da qeyd etmək lazımdır. Məşhur rus rejissoru Stanislavskinin fikrincə, yaradıcılığın ən əsas aparıcı qüvvəsi–hislərdir. Rus memarı Antokolski demişdir: “Emosiyasız bədii əsər yoxdur”. Məşhur rus alimi İ.P.Pavlov gənclərə yazdığı məktubda alimə məxsus keyfiyyətləri sadalayaraq yazırdı: “Üçüncü keyfiyyət–bu ehtirasdır. Yadda saxlayın ki, elm insandan bütün həyatını ona həsr etməyi tələb edir. Əgər sizdə iki həyat olarsa belə bu sizə bəs eləməzdi. Elm insandan böyük gərginlik və ehtiras tələb edir. İşinizdə və axtarışlarınızda ehtiraslı olun”.

Heç təsadüfi deyil ki, böyük ağıl sahibləri öz ideyalarına ehtirasla yanaşmaq keyfiyyətlərinə malik olmuşlar.

İlham, yaradıcılıq ekstazı vəziyyətində olan insan böyük şadlıq içərisində olur. Yaradıcı adam belə bir vəziyyətdə öz “mən”liyini itirərək yaratdığı obrazlara qarışaraq həmin aləmdə yaşayır.

Ekstaz vəziyyətində olan yaradıcı şəxsiyyət çox zaman oxuyaraq rəqs edə bilər. Məşhur kimyaçılar Gey-Lüssak və Devi öz kəşflərini etdikdən sonra kabinetlərində rəqs etmişdilər.

A.S.Puşkin özünün “Boris Qodunov” tragediyası ilə əlaqədar Vyazemskiyə göndərdiyi məktubda belə yazırdı: “Mənim faciəm bitdi: mən onu bir daha bərkdən oxudum və əl çalaraq, qışqıraraq dedim ki, ay səni it oğlu Puşkin!”.

P.İ.Çaykovski “Qaratoxmaq qadın” operasının axırıncı şəklini bitirdikdən sonra ağlamağa başlayıb.

Flober özünün “Madam Bavari” əsərində qəhrəmanın zəhərlənmə səhnəsini yazarkən o qədər ekstaz vəziyyətdə olub ki, sonradan onun özündə zəhərlənmə əlamətləri görünməyə başlayıb.

Məşhur fransız memarı Roden belə yazırdı: “Mən təbiəti dəyişdirmədim! Əgər dəyişdirmişəmsə də, onda şüursuz olaraq yaradıcılıq anında olub. Mənə elə gəlir ki, bu anda hislər təsir edib və mən təbiəti bu prizmadan görürdüm”.

Əsl yaradıcı adamlarda yaradıcılığa ilkin instiktiv tələbat mövcud olur.

İ.S.Turgenev deyilənlərə görə, daxili tələbatlarının nəticəsi olaraq əlinə qələm alıb yazırdı.

Dahilərin yaradıcılıq uğurlarında bir obyektə uzun müddət öz diqqətlərini yönəltmək bacarığının böyük rolu olduğunu inkar etmək mümkün deyildir.

Helmhols deyirdi ki, öz uğurları üçün hər hansı bir fikrə uzun müddət diqqət yönəltmək bacarığına minnətdardır.

Darvin öz "Tərcümeyi-halı"nda yazırdı: "Mən hələ çox əvvəllər növlərin yaranması haqqında fikirləşirdim, lakin bu vaxtdan onun üzərində iyirmi il ərzində işləməkdən əl çəkmədim".

Bu dediklərimizdən belə bir nəticəyə gələ bilərikmi ki, yaradıcılıq prosesi spontan idarə olunmazdır?

Lakin bu heç də elə deyildir. Yəni ilahi tərəfindən bir şəxsə istedad verilibsə, lakin həmin şəxs öz istedadının inkişafı uğrunda heç bir əməli fəaliyyət göstərmirsə, yəni zəhmət çəkmirsə bu istedad heç ola bilər. Bu mənada dahi rus bəstəkarı P.İ.Çaykovskinin fikri maraqlıdır: "İlahi pərisi elə bir qonaqdır ki, o, tənbəlləri sevmir". Digər tərəfdən P.İ.Çaykovskinin fikrincə insanda 25% istedad olarsa, 75% gərgin zəhmətin hesabına dahilik səviyyəsinə qalxmaq mümkündür. Çaykovskinin özü də hər gün səhərdən royal arxasına keçərək musiqi bəstələyirdi. İngilis yazıçısı Cek London hər gün mütləq iki min söz yazırdı. V.Mustafazadə hər gün 10 saat royal arxasında çalırdı. Ü.Hacıbəyli günün 8 saatını yaradıcılıq axtarışlarına həsr edirdi. F.Əmirov ilhamın gəlməsini gözləmədən hər gün 6 saat royal arxasında əyləşirdi. Məhz bu cür zəhmətin nəticəsi idi ki, bu böyük şəxsiyyətlər dünya mədəniyyəti üçün nadir sənət inciləri yarada bilmişdilər.

Həqiqətən əsl gözəlliyin, elmi axtarışların, kəşflərin yaranması uzunmüddətli gərgin zəhmət və bir fikrə, problemə daimi diqqət tələb edir. Yaradıcı adamlarla söhbət zamanı məlum olur ki, əgər o, stolun və ya musiqi alətinin arxasında oturursa, hətta bir nəticə alınmasa belə o işləyir, yəni yaradır. Bu proses isə onun texnikasının, bilik dairəsinin bacarıq və vərdişlərinin genişlənməsinə, artmasına, inkişaf etməsinə səbəb olur. Burada qədim bir el məsəli yada düşür: "Kotan işlədikcə parlayar".

Dahilərin həyat yolunu öyrənmək istedadlı gənclər üçün daha maraqlıdır.

*Rəyçi: prof. O.Rəcəbov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Abbasov V. Dahilərin, müdriklərin və fatehlərin həyat dərsləri. Bakı, 2010.

2. Mirzəcanzadə A. İxtisasa giriş. Bakı, 1990.

**Ф.Идаятова**

**Проблема гениальности**

**Резюме**

В статье указаны условия выявления и воспитания гениев. Автор старался в рамках статьи разъяснить, кого можно называть гением, способным и талантливым человеком.

**F.Hidayatova**

**The problem of genius**

**Summary**

In this article the terms of identifying and training geniuses are indicated. The author tries to explain that capable and talented person can be called a genius.

# TƏHSİLDƏ KEYFİYYƏTİN YÜKSƏLDİLMƏSİNİN MÜHÜM AMİLİNDƏN BİRİ

**Əsmər Bədəlova**
***pedaqogika üzrə fəlsəfə doktoru, dosent***

***Açar sözlər:*** *sinifdənxaric iş, şagird təşəbbüskarlığı, biliyə əsaslanan cəmiyyətdə müəllim kompetensiyaları.*

***Ключевые слова:*** *внеклассная работа, инициативы учеников, компетентности учителей в обшестве на основании знаний.*

***Key words:*** *extracurricular activity, students' initiatives, teacher competencies.*

Təlim və təhsilin təşkili formalarından biri olmaqla sinifdənxaric işlər olduqca zəngin məzmun və mündəricəyə malikdir. Onun faydası onilliklərlə əvvəl həm təcrübədə, həm də elmi – pedaqoji cəhətdən sübuta yetirilmişdir. Məlumdur ki, şagirdlərin təlim və tərbiyəsi işi dərslə tamamlanmır. Dərsdən sonrakı vaxtı düzgün tənzim etməklə təlim – tərbiyə işi elmi əsaslar üzərində davam edərsə, asudə vaxtdan səmərəli istifadə olunarsa, insanın yüksək intellektli, zəngin mənəviyyatlı şəxsiyyət kimi formalaşmasına fayda gətirər. Bu baxımdan sinifdənxaric işlər təlim–tərbiyənin keyfiyyətinin yüksəlməsinə müsbət təsir göstərən, ona fayda verən, ümumpedaqoji işi tamamlayan mühüm vasitə olar.

Sinifdənxaric işlərin həm təlim, həm də tərbiyə baxımından nə dərəcədə faydalı olduğu pedaqoji elmdə sübut edilmişdir. Təhsil ocaqlarında ondan hər fənnin özünün spesifik xüsusiyyətlərinə uyğun şəkildə istifadə təcrübəsi mövcuddur. Sinifdənxaric işlər istənilən proqram materialına dair əlavə biliklər verməyə, müəyyən problem, məsələlər ətrafında geniş və hərtərəfli iş aparmağa, fənnə xüsusi meyil göstərənlərlə digər şagirdlər arasında dərs prosesində mümkün olmayan məşğulluq həddini tənzimləməyə imkan yaradır. Ona görə də məktəbdə aparılan təlim və tərbiyə işinin bu yönümü hər zaman diqqət mərkəzində olmuşdur.

Təhsil hər zaman mənsub olduğu dövlətə xidmət etdiyi üçün dövrün tələbləri dəyişdikcə təhsilin məzmunu da dəyişir. Bununla yanaşı, sinifdənxaric işlər də zamanın tələbinə müvafiq tərz alır, məzmun yenilikləri ilə səciyyələnir. Lakin onun təşkili və keçirilməsinə verilən ümumi tələblər mövcuddur ki, onlar dəyişməzdir.

Belə düşünmək səhv olar ki, sinifdənxaric iş ancaq tərbiyə edir. O, həm də təlim vasitəsidir. Ona görə də müvafiq təlim materialı ilə, həyati hadisələrlə, tarixi məqamlarla əlaqəli hazırlanan sinifdənxaric iş mahiyyət etibarilə pedaqoji prosesi zənginləşdirən, şagirdlərə həm əqli, həm mənəvi zövq verən, onları məktəbin cazibəsində saxlayan, ziyanlı vərdişlərdən uzaqlaşdıran təlim və tərbiyə vasitəsidir. Məktəbdə sinifdənxaric tədbirlərin keçirilməsində məqsəd də budur. Bu məqsədi həyata keçirmək üçün müəllim dövrün və şəraitin tələblərinə uyğun prinsiplər seçməlidir. Prinsiplər həm ümumi–bütün kollektivlərə şamil edilə bilən, həm də spesifik–məktəb və məktəb mikromühitinin imkanlarına uyğun ola bilər. Onları bu cür təsnif etmək olar:

- sinifdənxaric işin həyatla, inkişafla əlaqələndirilməsi prinsipi;

- sinifdənxaric işin təlim materialları ilə əlaqələndirilməsi prinsipi;
- sinifdənxaric işin müvafiq təlim materialına fayda gətirə biləcək məqamda (ondan əvvəl, onunla paralel, ondan sonra) keçirilməsi prinsipi;
- sinifdənxaric işin tərbiyəedici prinsipi;
- sinifdənxaric işin inkişafetdirici prinsipi;
- şagirdlərin sinifdənxaric işlərə cəlb olunmasında onların meyil, maraq, istedad və bacarıqlarının, fərdi xüsusiyyətlərinin nəzərə alınması prinsipi;
- şagirdlərin sinifdənxaric işlərə cəlb olunmasında könüllülük prinsipi;
-sinifdənxaric işlərin təşkilində şagird təşəbbüskarlığının nəzərə alınması prinsipi və s.

Sadalanan prinsiplər nəzərə alınmaqla şagirdlərin sinifdənxaric işlərdə iştirakı fərdi, qrup halında və kollektiv səciyyə daşıyır. Onların hər üçü faydalıdır və bir–biri ilə əlaqəlidir. Belə ki, fərdi sinifdənxaric işlər məhz xüsusi istedad və bacarığı olan şagirdlər üçündür, sırf yaradıcı səciyyə daşıyır. Qrup halında keçirilən sinifdənxaric işlərə, məsələn, dərnəklərə istedadlılarla bərabər meyil və marağı olan şagirdlər cəlb edilir. Kütləvi işlər isə hamı üçündür. Bu işlərdə iştirakla hamını sevindirmək, diqqət mərkəzində saxlamaq, məqsədyönlü təlim və tərbiyəvi təsir göstərmək müəllimin öz istedadından, işinə məhəbbətindən və pedaqoji səriştəsindən asılıdır.

Yekun olaraq deyə bilərik ki, sinifdənxaric işlər təhsilin vacib komponentlərindən biridir. Onun həm təlim, həm də tərbiyəvi əhəmiyyəti vardır. Böyüməkdə olan nəslin təlim və tərbiyəsində sinifdənxaric işlərdən həmişə istifadə olunmuşdur. Lakin hər dövrün öz tələbi olduğu üçün müasir dövr sinifdənxaric işlərin məzmununa və təşkilolunma tərzinə yeni baxış tələb edir.

*Rəyçi: dos. Ə.Abbasov*

**İstifadə edilmiş ədəbiyyat**


1. Azərbaycan Respublikası Prezidentinin İkinci Bakı İqtisadi Forumunda çıxışı. // Azərbaycan, 5 oktyabr, 2012.
2. Talıbov Y. və başqaları. Məktəblilərin milli mentalitet əsasında tərbiyə edilməsi. Bakı: Maarif, 2004.
3. “Biliyə Əsaslanan Cəmiyyətdə Müəllim Kompetensiyaları: Siyasət, Pedaqogika və Sosial Vərdişlər” mövzusunda Beynəlxalq Konfransın Materialları. Bakı, 1- 2 dekabr, 2011.
4. Xəlilov V. Seçilmiş əsərləri. I cild. Bakı, 2011.


**Е.Бадалова**

**Внеурочная работа как основная роль в повышении качества образованиия**

**Резюме**

В статье говорится о стиле организации и новых взглядов в содержании внеурочных работ на современном этапе

**A.Badalova**

**Extracurricular activity as a main factor in enhancing the quality of education**

**Summary**

The article deals with the organization of extracurricular activities and developing new way of thinking.

# İNTERAKTİV İŞ FORMALARININ TƏHSİLİN KEYFİYYƏTİNƏ TƏSİRİ

**Tünzalə Qarayeva,**
**Ruhiyyə Məmmədova**
***Gəncə şəhər 44 nömrəli Bağça-Məktəb-Lisey Kompleksinin müəllimləri***

***Açar sözlər:*** *fəal təlim, kollektiv iş, qrup işi, fərdi iş, cütlərlə iş, potensial imkanlar, interaktiv təlim metodları.*

***Ключевые слова:*** *активное обучение, коллективная работа, групповая работа, самостоятельная работа, работа с парами, потенциальные возможности, интерактивные методы работы.*

***Key word:*** *interactive training, collective work, group work, individual work, pair work, potential opportunities, interactive teaching methods.*

Azərbaycan təhsil sistemində aparılan islahatların mühüm bir istiqaməti kurikulum islahatıdır. İslahatın əsas məqsədi gənc nəslin hərtərəfli bilik və bacarığa malik vətəndaş kimi formalaşdırılmasıdır.

Təlimdə müxtəlif iş formalarından istifadə edilməsi bir sıra amillərlə - dərsin məqsədi, şagird və müəllimlərin təcrübə səviyyəsi, vaxta qənaət, şagirdlərin imkanları, müəllimin şəxsiyyəti, metodikanın inkişaf səviyyəsi və s. ilə bağlıdır. Müəllim düzgün iş formasını şagirdini tanımaqla, dərsin məqsədlərini aydın təsəvvür etməklə, digər faktların bütün məzmununu nəzərə almaqla müəyyən edə bilər.

Kurikulumlarda təlim forması və üsullarına təlim strategiyasının mühüm tərkib hissəsi kimi yanaşılır. Onların mahiyyəti və əsas xüsusiyyətləri yeni qaydalara uyğun olaraq göstərilir. Bu prosesin interaktiv təlim metodları ilə işlənməsində bir sıra məsələlərə diqqət yetirilməlidir:

- Fəal təlim üçün iş formasının müəyyənləşdirilməsi.
- Fəal dərsin mərhələləri.
- Fəal dərsin strukturu.

Aparılan dərslərdə fəal təlimin şərti iş, cütlərlə iş, böyük və kiçik qruplarla iş kimi forma və metodlarından ardıcıl istifadə edilir.

Aydındır ki, kollektiv iş təlimin ən əsas və çox müraciət olunan formalarındandır. Digər iş formalarından fərqli olaraq bu iş forması zamanı şagirdlər daha çox sosiallaşır. Özlərini cəmiyyətin bir parçası kimi hiss edirlər. Onlarda özünəinam hisləri artır. Bəzi müəllimlər bu iş formasının səs-küyə səbəb olduğunu bəhanə gətirərək onun istifadəsindən boyun qaçırırlar. Lakin bütün təlim formalarının müsbət cəhətlərindən istifadənin zəruriliyi diqqətdən yayınmamalıdır.

Qruplarla iş forması təlimin ikinci formasıdır. Burada şagirdlər müəyyən problemi həll etmək üçün qrupda birləşirlər. Gündəlik təcrübəyə əsaslanaraq, demək olar ki, bu, şagirdlərin ən sevimli iş formasıdır. Qrup işində çalışmaq lazımdır ki, qrup öz tərkibinə görə güclü və zəif şagirdlərdən ibarət olsun. Tapşırıqlar səviyyəyə uyğun verilsin. Tapşırığın yerinə yetirilməsinə konkret vaxt ayrılmalı və bu, şagirdlərə bildirilməlidir.

Əgər zərurət yaranarsa, qruplara yanaşıb məsləhət verilməlidir.

Təcrübədə cütlərlə iş formasına da üstünlük verilir. Bu zaman şagirdlərdə daha yaxından əməkdaşlıq etməyə və ünsiyyət qurmağa, məsuliyyəti bölüşməyə optimal imkan yaranır. Lakin cütlərlə iş müəllimdən xüsusi peşəkarlıq tələb edir. Müəllim öz şagirdlərinin potensialına dərindən bələd olmalı, onların psixoloji durumlarını, bir-biri ilə uyğunlaşma dərəcələrini nəzərdən qaçırmamalıdır. Şagirdlərdən birinin digəri üzərində hegemonluq etməsinə şərait yaradılmamalı, onlarda xudbinlik hissinin formalaşmasının qarşısını alınmalıdır.

Fərdi iş forması şagirdin fəaliyyətini izləmək, potensial imkanlarını müəyyənləşdirmək və inkişaf etdirmək məqsədi daşıyır. Təlim prosesində fərdi iş hər bir şagirdin maraq və meyillərini nəzərə almağa, onların hər biri ilə iş aparmağa imkan verir. Fərdi iş formasından iki səbəbdən istifadə etmək məqsədəuyğundur. Elə şagirdlər var ki, üstün qavramaya malikdir, elə şagirdlər də var ki, mənimsəmədə nisbətən çətinlik çəkir. Fərdi iş forması şagirdin fərdi həyat təcrübəsini, maraqlarını və ya öz yaradıcılığını tələb edən tədqiqat işlərində daha çox istifadə olunur.

Fənn kurikulumlarında interaktiv iş formalarının mahiyyəti müstəqil düşünən, ətrafda baş verən hadisələrə tənqidi yanaşan, özünün və digərlərinin hüquqlarına hörmət edən, məsuliyyətli, insanlarla təmasdan çəkinməyən, milli-mənəvi dəyərlərimizə hörmətlə yanaşan, müstəqil Azərbaycanımıza layiqli övladların yetişdirilməsidir.

Buna nail olmaq üçün müəllim daim axtarışda olmalı, yaradıcı fəaliyyət göstərməlidir. Yaradıcı müəllim dərs prosesini sistemləşdirir, fəndaxili və fənlərarası inteqrasiyanı yaradır, şagirdləri müstəqil düşündürür. Yaradıcılıq – insanların bilik, duyğu, hərəkət və intuisiyalarını əhatə edən bütün funksiyaların sintezidir. Yaradıcı insanlar fərqli nəzər nöqtəsinə sahibdirlər.

Hər hansı bir ölkənin gələcək inkişafı onun təhsilinin səviyyəsi ilə müəyyən olunur. Təhsilin səviyyəsini yüksəltmək isə müəllimin başlıca vəzifəsidir. Azərbaycan təhsilinin günü-gündən inkişaf etdiyi, islahatların həyata keçirildiyi bir vaxtda təhsilin keyfiyyətini yüksəltmək müəllimi daim düşündürməlidir.

Təhsilin kefiyyətinin yüksəldilməsində aşağıdakılar vacib sayılmalıdır: hər bir şagirdə şəxsiyyət kimi baxmaq, onların hüquqlarına hörmətlə yanaşmaq. Fikirlərinə hörmət edib, sərbəst düşünmələri və mühakimə yürütmələrinə şərait yaratmaq; müəllim, valideyn, şagird münasibətlərinə diqqət etmək, şagirdlərin dərsə davamiyyətini tənzimləmək; dərs prosesində nizam-intizam yaratmaq; dərs prosesi zamanı şagirdlərdə dinləmə qabiliyyətini formalaşdırıb, diqqətini tam dərsə yönəltmək. Hər bir şagird sinif yoldaşının fikrinə hörmətlə yanaşmalıdır, çünki bu həm şagirdlərdə dinləmə mədəniyyətini formalaşdırır, həm də onlar dinləməklə öyrənir, biliyini möhkəmləndirirlər.

Dərsin keyfiyyətini yüksəldən səbəblərdən biri də təkrardır. Əgər belə demək mümkündürsə, təkrar şagirdin bilik bazasıdır. Çünki bu, şagirdin biliyini möhkəmləndirir, intellektual səviyyəsini artırır, dünyagörüşünü formalaşdırır, şüur səviyyəsini yüksəldir.

Dərsi şagirdlərin başa düşdüyü sadə şəkildə izah etmək də müəllimdən pedaqoji məharət tələb edir. O, izahı ilə dərsə marağı gücləndirməli, şagirdləri axtarışlara, məlumat əldə etməyə sövq etməlidir. Mürəkkəb məsələlərə sadə məsələlər vasitəsilə yol açmaqla şagirdləri düşündürmək olar. Bu zaman onlar fikirlərini nümunələrlə əsaslandırır, dərsi həyatla əlaqələndirir. Bu da fəal təlimə əsasən, dərslərdə sinfin fəallaşdırılmasını təmin edir. Şagirdlərdə danışmaq,

müzakirə etmək, qiymətləndirmək imkanı yaranır.

Artıq isbata ehtiyacı olmayan bir həqiqət var ki, təhsildə İKT-nin səmərəli tətbiqi həm müəllimlərin, həm də şagirdlərin yaradıcılıq imkanlarının genişləndirilməsinə müsbət təsir göstərir. Ona görə də müəllim hər bir metoddan sistemli şəkildə istifadə etməyi bacarmalıdır. Təlim və tərbiyə paralel olduqda təhsilin keyfiyyətini artırır, tam mənimsəməyə nail olunur.

Y.Komenski demişdir ki, təhsil və tərbiyə bilginin təbiəti və onların inkişafına dair qanunların mahiyyəti ilə səsləşməlidir.

Təlim və tərbiyə prosesi şagirdlərdə psixoloji qüvvələrin inkişafına imkan yaradır. Həmin imkanın olduğunu bilən və ondan istifadə edən müəllim öz şagirdlərində psixoloji qüvvələrin maksimum inkişafına nail ola bilir.

Psixoloji qüvvələri: diqqəti, hafizəsi, iradəsi, təxəyyülü, təfəkkürü və s. intensiv inkişaf edən şagirdlər təlim və tərbiyə zamanı daha çox uğur qazanırlar. Qazanılan hər bir uğur təhsilin keyfiyyətindən xəbər verir.

İnteraktiv təlim bütün bunlar üçün əsas istiqamətləndirici rol oynayır.

*Rəyçi: dos. R.Qəndilov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Bayramov Ə., Əlizadə Ə. Psixologiya. Ali məktəblər üçün dərslik. Bakı: Çinar-çap, 2002.
2. Kazımov N. Məktəb pedaqogikası. Bakı, 2009.
3. Musayev N. Müəllimin pedaqoji məharətinin təlimin keyfiyyətinə təsiri. // Azərbaycan məktəbi, 2013, № 1.
4. Veysova Z. Fəal / interaktiv təlim. Bakı, 2007.
5. Ümumtəhsil məktəblərinin I-IV sinifləri üçün fənn kurikulumları. Bakı: Təhsil, 2008.

**Т. Караева,**
**Р.Мамедова**

**Сутъ интерактивной работы на предметных занятиях по курикулуму**

**Резюме**

По мнению учителя, занятия, опирающиеся на интерактивные формы работы, должны строиться таким образом, чтобы учащиеся могли вовлечься в исследование, результат которого предполагает решение искомой проблемы.

Тем самым создается возможность получения новой информации посредством активной самостоятельной деятельности учеников.

**T.Garayeva**
**R.Mammadova**

**The essence of interactive work forms in the subject curriculums**

**Summary**

The article is dedicated to the lessons where interactive methods  are used .In interactive lessons  the teacher involves students to problem solving activity,students do research, share information and come to conclusion.Thus, students get information as a result of their independent work.